# Təfsir Elmi



Ramiz MƏMMƏDOV
Abdurrəhman NURUYEV

İPƏKYOLU NƏŞRİYYATI

Hazırlayan:

**Ramiz Məmmədov**

**Abdurrahman Nuri**

Ədəbi redaktor:

**Anar Qurbanov**

Nəşrə hazırlayan:

**Rüfət Şirinov**

İç dizayn:

**Əflatun Məmmədov**

Qapaq tərtibatı:

**Nicat Qəribov**

Bu kitab Azərbaycan Respublikası Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin **10 may 2016-cı il DK-416/M** nörməli razılıq məktubu ilə nəşr edilmişdir.

**Bakı-2016; İpəkyolu Nəşriyyatı: 193**
**İSBN: 978-9952-8297-2-3**




İPƏKYOLU NƏŞRİYYATI

Bakı Şəhəri Səbail Rayonu
Cəfərov Qardaşları, 16.
Tel: (+994 12) 492 14 38
Mobil: (+994 51) 412 22 82
Web sayt: www.ipekyolunesriyyati.az
Elektron poçt: ipekyoluneshriyyati@gmail.com

***Sənə də Quranı nazil etdik ki, insanlara onlara göndəriləni*** *(hökmləri, halal-haramı)* ***izah edəsən və bəlkə, onlar da düşünüb dərk edələr!***

*(Nəhl surəsi, 16/44)*

*“Hər kim Quranı oxuyub əzbərləyər, halal buyurduğunu halal, haram buyurduğunu da haram qəbul edərsə Allah o şəxsi cənnətinə qoyar. Eyni zamanda həmin şəxsə Allah-Təala ailəsindən cəhənnəmə gedəcək olanlardan 10 nəfərə də şəfaət etmə haqqını verər”* Tirmizi 2905

**MÜNDƏRİCAT**

**I FƏSİL / QURANİ-KƏRİMİN TARİXÇƏSİ**

**II FƏSİL / TƏFSİR ELMİ VƏ ƏSAS MƏFHUMLARI**



**III FƏSİL / QURAN ELMLƏRİ**



**IV FƏSİL / QURANI ANLAMA VƏ YORUMLAMA**



# I FƏSİL
# QURANİ-KƏRİMİN TARİXÇƏSİ

**HAZIRLIQ TAPŞIRIQLARI**

1. İslamdan əvvəl Ərəbistan yarımadasındakı dinləri araşdırın.
2. Vəhy kəlməsi və gəliş şəkilləri barədə məlumat əldə edin.
3. Qurani-Kərim endirildikdən sonra ayələr necə qorundu, günümüzə necə gəlib çıxdı?
4. Qurani-Kərimin kitab halına gətirilməsi və ilk yazılan musaflar haqqında məlumat verin.
5. Qurani-Kərimin digər adlarını öyrənin.

## I. QURANİ-KƏRİMİN MƏQSƏDİ VƏ ENDİRİLDİYİ DÖVRDƏKİ İCTİMAİ VƏZİYYƏT (nüzul ortamı)

Qurani-Kərim nazil olandan sonra dünyada siyasi, iqtisadi, mədəni, dini, sosial, elmi və s. sahələrdə dəyişikliklər meydana gəldi. Bütün bu dəyişiklikləri bilmək üçün həmin dövrdə dünyadakı vəziyyəti bilmək lazımdır.

Vəhyin gəldiyi Ərəbistan yarımadası Asiya qitəsinin cənub-qərbində yerləşir. Onun coğrafi mövqeyi, Şərqdən Oman dənizi və Bəsrə körfəzi, qərbdən Qırmızı dəniz, cənubdan da Ədən Körfəzi və Hind okeanı ilə əhatələnmişdir.




Ərəbistan yarımadasında insanların bir qismi köçəri, bir qismi də oturaq həyat sürürdü. Köçəri yaşayanlar heyvandarlıqla, digərləri də ticarət və əkinçiliklə məşğul olurdular. Qəbilələrdən mütəşəkkil olan bu diyar qan düşmənçiliyi ucbatından tez-tez müharibələrə şahid olurdu.

İslamdan əvvəl Ərəbistan yarımadasında Yəhudilik və Xristianlıq dini kimi səmavi dinlərə mənsub olan insanlar olsa da, bütpərəstlik daha geniş yayılmışdı. İnsanlar öz əlləri ilə düzəltdikləri bütlərə sitayiş edir, onlar üçün qurbanlar kəsirdilər. Hətta səfərə çıxdıqları zaman halvadan belə olsa bir büt düzəldər, yolda ona sitayiş edərdilər. Beləliklə, səfərlərinin uğurlu olacağına inanardılar.

Bütün bunlarla birlikdə bütpərəstlərdə Allah inancı mövcud idi. Onlar bu bütlər vasitəsi ilə Allaha yaxınlaşdıqlarına inanırdılar. Bu barədə Qurani-Kərimdə belə buyurulur: ***“Bil ki, xalis din*** *(sırf ibadət, təmiz itaət)* ***ancaq Allaha məxsusdur. Allahı qoyub*** *(bütləri)* ***özlərinə dost tutanlar: “Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!”*** *(deyirlər)****. Şübhəsiz ki, Allah ixtilafda olduqları məsələlər barəsində*** *(qiyamət günü)* ***onların arasında hökm edəcəkdir.***

***Allah yalançı, nankor olan kimsəni doğru yola müvəffəq etməz!"*** (Zümər 39/3)



Yuxarıda qeyd etdiyimiz kimi Ərəb yarımadasında geniş vüsət alan inanc bütpərəslik idi. Ancaq bununla bərabər yəhudi, xristian, məcusi, sabii və həniflər də vardı. Həniflər Hz. İbrahimin (əs) dinini davam etdirən və tövhid inancını mənimsəyən kimsələrdi.

Ərəbistan yarımadasının ən məşhur şəhəri Məkkə idi. Bu şəhərin Ərəbistanda üstün mövqeyə sahib olmasının ən başlıca səbəbi Kəbə idi. Kəbəni Uca Allahın əmri ilə Hz. İbrahim və onun oğlu Hz. İsmail peyğəmbər inşa etmişdi. Ancaq zaman keçdikcə tövhid inancı unudulmuş və Kəbənin içi bütlərlə doldurulmuşdu. Kəbə və onun ətrafı müqəddəs qəbul olunduğuna görə, ətrafda yaşayan qəbilələr öz bütlərini buraya gətirir, müəyyən vaxtlarda gəlib onu ziyarət edir və ona sitayiş edirdilər.

Beləliklə, Kəbə sanki bütpərəslərin dini mərkəzinə çevrilmişdi. Bu səbəbdən Məkkə bütün Ərəbistanın dini mərkəzi kimi qəbul olunurdu. Buna bağlı olaraq Məkkə şəhəri iqtisadi, siyasi və sosial baxımdan Ərəbistanda mühüm mövqeyə sahib idi.

Bütün Ərəbistan yarımadasından insanların Məkkəyə olan axını bu şəhərdə bazarların qurulması üçün əlverişli şərait yaradırdı. Bunu fürsət bilən məkkəlilər öz ticarət fəaliyyətlərini genişləndirirdilər. Bunun nəticəsində Məkkə xalqı digər şəhərlərlə müqayisədə çox zəngin idi.

Həmin dövrdə Ərəbistan yarımadasında şeir və natiqlik sənəti çox inkişaf etmiş, fəsahət və bəlağət zirvə dövrünü yaşayırdı. İmrulqeys, Əntərə, Nabiğə, Züheyr, Əşa, Xənsa, Həssan ibn Sabit kimi şairlərin şöhrəti bütün Ərəbistana yayılmışdı. Ərəb qəbilələrinin əksəriyyətinin axışıb gəldiyi Ukaz bazarında şeir müsabiqələri təşkil olunur, həmin müsabiqələrdə qalib gələn şairin şeiri Kəbə divarına asılırdı. Şifahi ədəbiyyatın bu qədər güclü inkişaf etməsinə baxmayaraq, oxuma və yazma bilənlərin sayı olduqca az idi.

İslam dinindən əvvəl xüsusi ilə Ərəbistan yarımadasında, ümumiyyətlə dünyada sosial bərabərsizlik, ədalətsizlik, zülm və anarxiya hökm sürürdü. Qurani-Kərim bu dövrü "Cahiliyyə dövrü" adlandırmışdır. Bu dövrdə qullar, kasıblar və zəiflər güclülər tərəfindən istismar edilir, qadınlara söz haqqı tanınmır, mirasdan məhrum edilirdi. Bundan əlavə, qadınlar kişilər tərəfindən rüsvayçılığın səbəbi kimi qəbul olunurdu. Məhz bu anlayışın nəticəsində qız uşaqları diri-diri torpağa basdırılaraq öldürülürdü.

Həmin dövr bəşəriyyətin yaşadığı zülmün, qəddarlığın zirvəsinə şahid olurdu. Bu barədə Hz. Ömər belə deyir: *"Cahiliyyə vaxtı iki şey var idi ki, onların birini xatırlayanda gülür, digərini xatırlayanda isə ağlayıram. Məni güldürən hadisə, səfərə çıxdığımız vaxt özümüzlə aparmaq üçün halvadan büt düzəldər, yolda ona sitayiş edər, acanda isə onu yeyərdik. Ağladan hadisə isə, qız uşaqlarımızı diri-diri torpağa basdırmağımız idi"*. Bu barədə Qurani-Kərim bizə belə xəbər verir: ***"Onlardan birinə qızı olması ilə müjdə verdikdə qəzəblənib üzü qapqara qaralar. Verilən müjdənin pisliyi üzündən tayfasından qaçıb gizlənər.*** *(Allah bilir!)* ***Görəsən, onu*** *(o körpəni)* ***zillət içində saxlayacaq, yoxsa torpağa göməcək?*** *(Diri-diri basdıracaq?)* ***Bir görün onlar necə pis mühakimə yürüdürlər!*** *(Oğlanları özlərinə götürüb qızları Allaha isnad edirlər.)****"*** (Nəhl 16/58-59)

İslam dininin gəldiyi illərdə müxtəlif cinayətlər, qumar, içki, oğurluq kimi pis vərdişlər də baş alıb gedirdi. Ancaq bu mənfi xüsusiyyətlərin yanında ərəblər arasında comərdlik, qonaqpərvərlik,

cəsarət, sözündə durma, onlardan aman istəyənləri qoruyub himayə etmək kimi müsbət xüsusiyyətlər də mövcud idi. Ancaq bütün bu müsbət hallar, adətən, özlərini başqalarına nümayiş etdirmək üçün olurdu.

## II. QURANİ-KƏRİMİN ENDİRİLDİYİ VAXT MƏKKƏDƏKİ SOSİAL, İQTİSADİ, MƏDƏNİ VƏ DİNİ VƏZİYYƏT

| SOSİAL VƏZİYYƏT | İQTİSADİ VƏZİYYƏT | MƏDƏNİ VƏZİYYƏT | DİNİ VƏZİYYƏT |
|---|---|---|---|
| Qəbilə həyatı və qan düşmənçiliyi | Ticarət | Şeirin inkişaf etmiş olması | Bütpərəstlik |
| Sinfi cəmiyyətin olması | Kənd təsərrüfatı | Oxuma və yazmanın olmaması | Xristianlıq |
| İçkinin, fal oxlarının, qumarın yayğın olması | Heyvandarlıq | Şifahi ədəbiyyatın güclü olması | Yəhudilik |
| Sosial bərabərsizliyin olması | | | Məcusilik |
| Zülmün mövcud olması | | | Sabiilik |
| | | | Həniflik |

1. ***“Həqiqətən, bu Quran*** *(bütün bəşəriyyəti)* ***ən doğru yola*** *(islama)* ***yönəldir, yaxşı işlər görən möminlərə böyük bir mükafata nail olacaqları ilə müjdə verir!”*** (İsra, 17/9)

2. ***“Əlif, Lam, Ra!*** *(Ya Rəsulum! Bu Quran)* ***elə bir Kitabdır ki, onu sənə insanların öz Rəbbinin izni ilə zülmətlərdən nura*** *(küfrdən imana)* ***– yenilməz qüvvət sahibi,*** *(hər cür)* ***tərifə*** *(şükürə)* ***layiq olan Allahın yoluna*** *(islam dininə)* ***çıxartmaq üçün nazil etmişik”.*** (İbrahim, 14/1)

3. ***“****(Ya Rəsulum!)* ***De: “Ruhülqüds*** *(Cəbrail)* ***onu*** *(Quranı)* ***sənin Rəbbindən iman gətirənlərə səbat vermək, müsəlmanları isə doğru yola yönəltmək və*** *(onlara Cənnətlə)* ***müjdə vermək üçün haqq olaraq nazil etmişdir!”*** (Nəhl, 16/102)

4. ***“****(Ey insanlar!)* ***Sizə Rəbbinizdən bir öyüd-nəsihət, ürəklərdə olana*** *(cəhalətə, şəkk-şübhəyə, nifaqa)* ***bir şəfa, möminlərə hidayət və mərhəmət*** *(Quran)* ***gəlmişdir!”*** (Yunus, 10/57)

Yuxarıdakı ayələrdən qaydalar çıxardın.

1. Quran insanları düzgün yola yönəldir.

2. .........................................................

3. .........................................................

Belə bir vəziyyətdə Qurani-Kərim nazil olmağa başladı. Qurani-Kərim başda Allaha şərik qoşmağı rədd edərək yuxarıda qeyd olunan mənfi halları aradan qaldırmaq, o cümlədən comərdlik, qonaqpərvərlik, cəsarət, sözündə durmaq kimi müsbət halların mənbəyinin riyakarlıq deyil, sırf Allah (c.c.) rizası üçün olmasını istəmişdir.

Bu səbəbdən vəhyin gəliş məqsədi insanların zehinlərində tövhid inancını yerləşdirərək ibadətin ancaq və ancaq bütün aləmlərin yaradıcısı olan Allah-Təalaya edilməsi, insanlar arasında ədaləti, yaxşılığı, gözəlliyi, xeyirxahlığı, qohumlara qarşı yaxşı rəftar etməyi, pis şeylərdən uzaqlaşdırmağı, beləliklə, insanların həm bu dünyadakı rifahını, həm də axirətdəki səadətini təmin etmək, qısacası, insanlığı qaranlıqdan aydınlığa çıxartmaq olmuşdur.

## III. VƏHY VƏ QURANİ-KƏRİMİN NAZİL OLUNMASI

### A. Vəhy

Vəhy sözünün lüğəti mənası "gizli və sürətli bir şəkildə bildirmək", "ilham etmək", işarə etmək", "fısıldamaq", "əmr etmək", "yazmaq", "vəsvəsə vermək", "təlqin etmək"dir. Termin mənası isə **"Allahın insanlara çatdırılmaq üzrə seçdiyi peyğəmbərlərinə Cəbrail mələyi vasitəsi ilə və ya onsuz əmr və qadağalarını bildirməsidir."**

Qurani-Kərimdə vəhy sözü müxtəlif mənalarda istifadə olunur. Ona görə də biz vəhyi iki bölməyə ayıraraq izah edəcəyik:

#### 1. İlahi olmayan vəhy

Qurani-Kərimdə bununla əlaqədar misallar aşağıdakılardır:

فَخَرَجَ عَلَىٰ قَوْمِهِ مِنَ الْمِحْرَابِ فَأَوْحَىٰ إِلَيْهِمْ أَنْ سَبِّحُوا بُكْرَةً وَعَشِيًّا

***"Sonra** (Zəkəriyya) **mehrabdan** (məbəddən) **öz camaatının qabağına çıxıb onlara belə işarə etdi: "Səhər-axşam** (Allahı) **təqdis edib şəninə təriflər deyin!"** (Və ya namaz qılın!)**"*** (Məryəm 19/11)

Yuxarıdakı ayədə görüldüyü kimi "vəhy" sözü "işarə etmək" anlamında istifadə olunmuşdur. Həmçinin başqa bir ayədə belə buyurulur.

وَكَذَٰلِكَ جَعَلْنَا لِكُلِّ نَبِيٍّ عَدُوًّا شَيَاطِينَ الْإِنْسِ وَالْجِنِّ يُوحِي بَعْضُهُمْ إِلَىٰ بَعْضٍ زُخْرُفَ الْقَوْلِ غُرُورًا ۚ وَلَوْ شَاءَ رَبُّكَ مَا فَعَلُوهُ ۖ فَذَرْهُمْ وَمَا يَفْتَرُونَ

***"Beləcə, Biz hər peyğəmbər üçün insan və cin şeytanlarından düşmənlər yaratdıq. Onlar** (biri digərini) **aldatmaq məqsədilə bir-birinə təmtəraqlı** (zahirən gözəl, daxilən çirkin) **sözlər təlqin edərlər. Əgər Rəbbin istəsəydi, onlar bunu etməzdilər. Onları uydurduqları yalanlarla birlikdə boşla getsinlər!"*** (Ənam 6/112)

İlahi vəhylə,ilahi olmayan vəhy arasındakı fərqi yoldaşlarınızla müzakirə edin!

Buradakı "vəhy" kəlməsi "fısıldamaq, təlqin etmək" mənalarında işlənmişdir.

Vəhyin bu növü canlılar arasında baş verən hadisələrdə istifadə olunmuşdur. Yəni, burada Uca Allahın insana və ya başqa bir məxluqa etdiyi vəhydən söhbət getmir.

**2. İlahi vəhy**

Burada vəhy edən Allah-Təala, vəhy olunan isə məxluqatıdır. İlahi vəhy xüsusi olaraq peyğəmbərlərə, ümumi olaraq da digər məxluqata edilən vəhy növüdür. Belə olan təqdirdə ilahi vəhyi beş maddədə izah etmək olar.

**a) Cansızlara edilən vəhy:**

Aşağıdakı ayə bunun misalıdır:

وَقَالَ الْإِنْسَانُ مَا لَهَا يَوْمَئِذٍ تُحَدِّثُ أَخْبَارَهَا بِأَنَّ رَبَّكَ أَوْحَىٰ لَهَا

***“İnsan** (təəccüblə)**: “Buna** (bu yerə) **nə olub?” - deyəcəyi zaman, məhz o gün** (yer) **öz hekayətini söyləyəcəkdir. Çünki** (bunu) **ona sənin Rəbbin vəhy etmişdir** (buyurmuşdur)**!”*** (Zilzal 99/3-5)

Burada istifadə olunan “vəhy” sözü Uca Allahın yerə əmr etməsidir.

**b) Canlılara edilən vəhy:**

Aşağıdakı ayəni buna misal vermək olar:

وَأَوْحَىٰ رَبُّكَ إِلَى النَّحْلِ أَنِ اتَّخِذِي مِنَ الْجِبَالِ بُيُوتًا وَمِنَ الشَّجَرِ وَمِمَّا يَعْرِشُونَ

***“Rəbbin bal arısına belə vəhy** (təlqin) **etdi: “Dağlarda, ağaclarda və** (insanların) **qurduqları çardaqlarda** (evlərin damında, üzümlüklərdə) **özünə evlər tik** (pətəklər sal)**”.*** (Nəhl 16/68)

**c) Mələklərə edilən vəhy:**

إِذْ يُوحِي رَبُّكَ إِلَى الْمَلَائِكَةِ أَنِّي مَعَكُمْ فَثَبِّتُوا الَّذِينَ آمَنُوا سَأُلْقِي فِي قُلُوبِ الَّذِينَ كَفَرُوا الرُّعْبَ فَاضْرِبُوا فَوْقَ الْأَعْنَاقِ وَاضْرِبُوا مِنْهُمْ كُلَّ بَنَانٍ

*“(Ya Peyğəmbərim!) **Xatırla ki, o zaman Rəbbin mələklərə belə vəhy edirdi: “Mən də sizinləyəm. Möminlərə qüvvət** (mətanət) **verin. Mən kafirlərin ürəklərinə qorxu salacağam. Onların boyunlarını vurun, bütün barmaqlarını** (əl-ayaqlarını) **doğrayın!”*** (Ənfal 8/12)

**d) İnsanlardan peyğəmbər olmayanlara -Musanın (ə.s) anasına və İsanın (ə.s) həvarilərinə edilən vəhy:**

وَإِذْ أَوْحَيْتُ إِلَى الْحَوَارِيِّينَ أَنْ آمِنُوا بِي وَبِرَسُولِي قَالُوا آمَنَّا وَاشْهَدْ بِأَنَّنَا مُسْلِمُونَ

***“Xatırla ki, o zaman həvarilərə** (İsanın on iki əshabəsinə)**: “Mənə və peyğəmbərimə iman gətirin!” – deyə əmr etmişdim. Onlar isə: “Bizim** (Sənə və peyğəmbərinə) **itaətkar kəslər olmağımıza şahid ol!” – deyə cavab vermişdilər”.*** (Maidə 5/111)

وَأَوْحَيْنَا إِلَىٰ أُمِّ مُوسَىٰ أَنْ أَرْضِعِيهِ

***“Biz Musanın anasına** (ilham yolu ilə, yaxud röyada)**: “Onu** (Musanı) **əmizdir...”*** (Qasas 28/7)

Yuxarıdakı hər iki ayədə də “vəhy” sözü “ilham” mənasında istifadə olunmuşdur.

**e) Həqiqi vəhy**

Həqiqi vəhy Allah-Təala tərəfindən peyğəmbərlərinə göndərilən vəhydir. Uca Allah peyğəmbərlərinə vəhy etdiyini Quranі-Kərimdə belə xəbər verir: ***“Nuha və ondan sonrakı peyğəmbərlərə vəhy etdiyimiz kimi sənə də vəhy etdik”.*** (Nisa 4/163)

Uca Allahın insanlarla bir qayda olaraq üç formada -vəhy yoluyla, pərdə arxasından, və ya bir elçi vasitəsi ilə əlaqə yaratdığını aşağıdakı ayədən öyrənirik:

وَمَا كَانَ لِبَشَرٍ أَنْ يُكَلِّمَهُ اللّٰهُ إِلَّا وَحْيًا أَوْ مِنْ وَرَاءِ حِجَابٍ أَوْ يُرْسِلَ رَسُولًا فَيُوحِيَ بِإِذْنِهِ مَا يَشَاءُ إِنَّهُ عَلِيٌّ حَكِيمٌ

*“(Heç bir bəşər övladına Allahla danışmaq müyəssər olmaz, çünki bəşər övladı olan peyğəmbərlər maddi aləmdə, zaman və məkan daxilində olduqları halda, Allah qeyri-maddidir, zaman və məkan xaricindədir. Allahla onlar arasında minlərlə zülmət və nur pərdəsi vardır. Buna görə də Allahın peyğəmbərlərlə bir yerdə qarşı-qarşıya durub danışması qeyri-mümkündür)**. Allah bəşər övladı ilə** (Musanın anası ilə olduğu kimi) **ancaq vəhylə** (ilham və röya ilə)**, yaxud** (Musa kimi) **pərdə arxasından danışar** (Allahın kəlamı eşidilər, amma Özü görünməz)**. Və ya bir elçi** (mələk) **göndərər ki, o da Allahın izni ilə** (göndərildiyi kimsəyə) **Onun istədiyini vəhy edər. Həqiqətən, O** (hər şeydən) **ucadır, hikmət sahibidir!”*** (Şura 42/51)

Göründüyü kimi yuxarıdakı ayədə Allah-Təala yaratdığı bəşər ilə əlaqə qurmanın birinci yolunun vəhy olduğunu bildirmişdir. Yəni, vəhy Allah-Təalanın vasitəsiz, çox sürətli və gizli olaraq bəşər övladına bilgi verməsi, onun qəlbinə həmin bilgini yerləşdirməsi, ilham etməsidir. Bu formadakı vəhy həm peyğəmbərlər, həm də bəzi insanlar üçün olmuşdur. Hz. Musanın anasına və Hz. İsanın həvarilərinə edilən vəhy belə vəhydir.

Ayədə qeyd edilən Allah-Təalanın bəşər övladı ilə danışmasının ikinci yolu şifahi danışmadır. Burada dinləyən danışanı görməz. Ancaq yaxın bir yerdən onunla danışan gizli bir varlığın olduğunu bilər. Uca Allahın Hz. Musa və Hz. Peyğəmbərimizlə bu formada danışdığı məlumdur.

Üçüncüsü isə vəhyin elçi göndərilərək çatdırılmasıdır. Bu da Uca Allahın (c.c.) mələk vasitəsi ilə göndərdiyi vəhy növüdür. İslam alimlərinə görə bu da iki formada olmuşdur. Birincisi, Hz. Peyğəmbərin bəşəri xüsusiyyətlərindən sıyrılaraq mələki aləmə keçməsi ilə mümkün olmuşdur ki, bu vəhyin ən ağır olan formasıdır. Bu formada vəhy gəldikdə Peyğəmbərimizin rəngi saralar, tərlər, hətta əbasını başına çəkib bayılarmış. Bu zaman onun üzərinə həddindən artıq ağırlıq çökərmiş. Rəvayətə görə, bir dəfə Hz. Peyğəmbər (s.ə.s.) dəvə belində gedərkən ona vəhy nazil olmuş, dəvə vəhyin ağırlığına tab gətirə bilməyib ayaqları üstə yerə çökmüşdü.

İkincisi də mələyin bir insan cildinə girərək insanlara görünmədən Rəsulullaha vəhy gətirməsidir. Cəbrailin (əs) Dihyə əl-Kəlbin surətində Hz. Peyğəmbərimizə (s.ə.s.) vəhy gətirdiyi rəvayət olunur. Bu formada gələn vəhy ən yüngül olan vəhydir.

“Bəqərə” surəsinin sonuncu iki ayəsindən başqa, Qurani-Kərim Hz. Peyğəmbərə (s.ə.s.) Allah-Təalanın əmri ilə vəhy mələyi Cəbrail (əs) vasitəsi ilə nazil olmuşdur. Mələyin əsas vəzifəsi Allah-Təalanın əmrlərini peyğəmbərlərə olduğu kimi çatdırmaq, onları oxutdurub öyrətmək və əzbərlətməkdir. Mələk tərəfindən peyğəmbərlərə təlim edilən vəhy heç bir zaman unudulmur, onların hafizəsinə nəql olunub qalır. Sonra peyğəmbərlər həmin əmr və hökmləri olduğu kimi öz ümmətlərinə təbliğ edirlər.

Yuxarıda qeyd edilən vəhyin gəliş şəkillərini maddələr halında belə sadalamaq mümkündür:

**B. Hz. Peyğəmbərə (s.ə.s.) vəhyin gəliş şəkilləri**

***1. Sadiq röya:*** Hz. Peyğəmbərə vəhyin ilk gəliş şəkli sadiq röyalarla olmuşdur. Həzrət Peyğəmbər olacaq hadisələri əvvəlcədən sadiq yuxularla görürdü.

***2. Cəbrailin (əs) insan cildində Peyğəmbərimizə vəhyi gətirməsi:*** Peyğəmbərimizə ən asan gələn vəhy budur. Rəsulullah (s.ə.s.) belə buyurur: *"Bəzən də mələk mənə insan cildinə girərək gəlir, mənimlə danışır, mən də onun söylədiyini yadımda saxlayıram".* (Buxari, Bədül-Vəhy, 2)

**BUNU BİLİRDİNİZMİ?**

Sadiq röyaya vəhyin 46-da bir cüzü olduğu deyilməsinin səbəbi 23 illik nübuvvətin ilk 6 ayının vəhyin sadiq röyalarla gəlməsi ilədir.

***3. Zəng cingiltisinə və arı vızıltısına bənzər səslə gələn vəhy:*** Bu barədə Peyğəmbərimiz belə buyurur: *"Bəzən vəhy mənə zəng səsinə bənzəyən bir səslə gəlir. Vəhyin bu gəliş şəkli mənim üçün ən ağır olanıdır".* (Buxari, Bədül-Vəhy, 2)

***4. Cəbrailin (əs) öz surətində gətirdiyi vəhy:*** Qurani-Kərimdə bu haqda belə buyurulur: ***"And olsun ki, o** (Peyğəmbər)**, onu** (Cəbraili) **aydın üfüqdə görmüşdür"*** (Təkvir 81/23) Bu formada gələn vəhy iki dəfə olmuşdur. Birincisi, Hira mağarasında enən vəhydir. Allahın Rəsulu (s.ə.s.) gördüyü bu mənzərə qarşısında özündən getmişdir. İkincisi də, Meracda baş vermişdir.

**OXUYAQ!**

Qasas surəsinin 30-35-ci və Nəcm surəsinin 1-18-ci ayələrini tərcüməsini oxuyub yoldaşlarınızla paylaşın.

***5. Hz. Peyğəmbərin pərdə arxasından aldığı vəhy:*** Uca Allahı görmədən Allahın Peyğəmbərimizlə danışmasının keyfiyyəti bizə məlum olmayan, insanların düşüncə və duyğularından uzaq olan bir vəhy növüdür. Beş vaxt namazın müsəlmanlara fərz olması və Bəqərə surəsinin son iki ayəsi bu vəhylə nazil olmuşdur.



Vəhyin mənaları haqqında yoldaşlarınızla müzakirə aparın

***6. İlham yoluyla:*** Cəbrail (əs) vasitəsi ilə deyil, birbaşa Hz. Peyğəmbərin (s.ə.s.) qəlbinə endirilən vəhy növüdür.

Yuxarıda vəhyin gəliş şəkilləri ilə bağlı məlumatları qeyd etdikdən sonra vəhyin ilk dəfə hansı formada və necə başladığına nəzər salaq.

**C. Vəhyin başlanğıcı**

Hz. Peyğəmbərə ilk vəhyin gəlişini Hz. Aişə (r.ə.) belə anladır:

"Rəsulullaha (s.ə.s.) ilk vəhyin başlaması sadiq röyalarla olmuşdur. Onun gördüyü bütün yuxular səhərin aydınlığı kimi həqiqət olurdu. Bu vəziyyət altı aya qədər davam etdi.

Sonra Hz. Peyğəmbər insanlardan uzaqlaşıb tənha qalmaq istədi. Bunun üçün Hira dağındakı mağarada xəlvətə çəkildi. Günlərlə orada qalaraq ibadətlə məşqul olmağa başladı. Bəzən evə qayıdar, azuqəsini götürər, təkrar mağaraya geri dönərdi

Bu vəziyyət Hirada ona ilahi vəhy gələnə kimi davam etdi. Yenə bir gün Hirada olanda birdənbirə vəhy mələyi Cəbrail (əs) gəldi və:

-Oxu! -dedi. Peyğəmbərimiz:

-Mən oxuya bilmirəm, -deyə cavab verdi.

Peyğəmbərimiz daha sonra hadisəni belə anladır:

“Mələk məni tutub taqətim kəsilənə qədər sıxdı və sonra buraxıb təkrar: -Oxu! -dedi. Mən də ona:

-Mən oxuya bilmirəm”, -dedim. Bunun müqabilində məni yenə eyni şəkildə tutdu və taqətim kəsilənə kimi sıxdı. Sonra buraxıb yenə:

-Oxu! -dedi. Mən yenə ona:

-Oxuya bilmirəm”, -dedim. Bundan sonra məni üçüncü dəfə tutub taqətim kəsilənə qədər sıxdı. Sonra özü “Ələq” surəsinin ilk beş ayəsini oxudu”.


Hira mağarasının olduğu Nur dağı

Bu hadisədən sonra Hz. Peyğəmbər qorxudan titrəyə-titrəyə xanımı Hz. Xədicənin (r.ə.) yanına qayıtdı və: “Üstümü örtün, üstümü örtün!” -dedi. Qorxusu gedənə kimi bu halı davam etdi. Sonra başına gələnləri xanımına danışdı. Əsil-nəcabətli bir qadın olan Hz. Xədicə (r.ə.): “*Sən qorxma! Allaha and içirəm ki, Allah səni heç vaxt utandırmaz. Çünki sən qohumlara köməkliyini əsirgəmir, onları müdafiə edir, zəiflərə yardım əlini uzadır, kasıblara yaxşılıq edirsən*”, -deyərək Hz. Peyğəmbərə təsəlli verdi.




İlk nazil olan “Ələq” surəsinin 1-5-ci ayələrini əzbərləyin

Hz. Peyğəmbər ona şeytanın ürcah olmasından çox qorxmuşdu. Xanımının təskinedici sözləri ona dərman kimi gəlmişdi.

Bu sözlərdən sonra Hz. Xədicə Rəsulullahı (s.ə.s.) əmisi oğlu Vərəqə ibn Nofəlin yanına apardı. Vərəqə xristian idi. Yaşlı olduğu üçün gözləri görmürdü.

Xədicə Vərəqəyə Hz. Peyğəmbərimizin başına gələnləri danışmağa başladı. Hadisəni dinləyən Vərəqə belə cavab verdi:

-Sənin gördüyün Allahın Musaya göndərdiyi Namusu-əkbər deyə adlandırılan Cəbraildir. Ah! Kaş sənin dəvət günlərində gənc olaydım. Qövmün səni yurdundan çıxartdıqları gün həyatda olaydım!

Vərəqənin söylədiklərini dinləyən Hz. Peyğəmbər:

-Onlar məni yurdumdanmı çıxaracaqlar? -deyə soruşdu. O da:

-Bəli. Çünki sənin kimi göndərilən elə bir peyğəmbər yoxdur ki, həmvətənləri tərəfindən düşmənçiliyə məruz qalmasın. Sənin insanları Allahın dininə dəvət etdiyin zamanı görsəydim, bütün gücümlə sənə köməklik göstərərdim! -deyə cavab verdi.

Beləliklə, Allah-Təala tərəfindən sonuncu peyğəmbəri olan Hz. Muhammədə (s.ə.s.) olan vəhyi başlamış oldu.

## IV QURANİ-KƏRİM

Qurani-Kərim Allah-Təala tərəfindən Cəbrail (əs) vasitəsi ilə 23 il müddətində Hz. Peyğəmbərimizə göndərilən ilahi bir kitabdır. Rəsulullah aldığı Quran vəhyini olduğu kimi insanlara təbliğ edərək insanları qaranlıqdan aydınlığa çıxartmışdır.

Aşağıda Qurani-Kərimin mənası, adları, onun yazılması, və s. haqda geniş məlumatlar verilmişdir.

### A. Qurani-Kərimin mənası

Qurani-Kərim sözünün mənşəyi haqqında alimlər tərəfindən müxtəlif fikirlər irəli sürülmüşdür. Bəzilərinə görə, Quran sözü Tövrat və İncil kimi heç bir kökdən əmələ gəlməmişdir. Məsələn, İmam Şafe bu fikri mənimsəyən alimlərdən biridir. Digərlərinə görə isə, Quran sözü aşağıdakı kəlmələrdən əmələ gələn isimdir:

- “Toplamaq” mənasına gələn “اَلْقَرْءُ / əl-qaru” kəlməsindən əmələ gəlmiş və keçmiş kitabların meyvələrini topladığı, müjdə, qorxutma, əmr, qadağa, qissə, surə və ayələri cəm etdiyi üçün bu adı almışdır.


Qurani-Kərim sözünün mənalarını yoldaşlarınızla müzakirə edin!

- “Oxudu” mənasına gələn “قَرَاَ / Qaraə” feilindən əmələ gəlmiş və “oxunan kitab” olduğu üçün bu adı almışdır.
- “Dəlil, bürhan” mənasına gələn “قَرِينَةٌ / qərinə” kəlməsinin cəmi olan “qərain” sözündən əmələ

gəlmiş və ayələri məzmun, nəzm, vəzn, və ahəng yönündən bir-birinə bənzədiyi və bir-birinə dəlil olduğu üçün bu adı almışdır.

- “Bir şeyi digərinə yaxınlaşdırdı” mənasına gələn “قَرَنَ / qarənə” feilindən əmələ gəlmiş və surələri, ayələri və hərfləri bir-birinə yaxın və bitişik olduğu üçün bu ad verilmişdir.

Yuxarıdakı müxtəlif fikirlərə baxanda görürük ki, qeyd eilən hər bir rəy Qurani-Kərimin bir xüsusiyyətini ifadə edir. Yəni Qurani-Kərim Uca Allahın Hz. Muhamməda (s.ə.s.) endirdiyi ilahi kitabın xüsusi adı olmaqla yanaşı, yuxarıdakı lüğəti mənalarının hər birini də özündə əks etdirən ilahi bir kitabdır.

Qurani-Kərimin termin mənası isə belədir: “Qurani-Kərim Hz. Muhamməda (s.ə.s.) vəhy yolu ilə endirilmiş, müshəflərdə yazılmış, təvatürlə nəql olunmuş, tilavəti ilə ibadət olunan ecazkar bir kəlamdır”.

Bu tərif aşağıdakı mənaları özündə əksetdirir:

- Qurani-Kərim Hz. Peyğəmbərə vəhy yolu ilə endirilmişdir. Yəni Quranın mənbəyi ilahi olduğu ifadə olunmuşdur.
- Qurani-Kərimin hamısı Hz. Peyğəmbər (s.ə.s.) vəfat etmədən əvvəl yazılmış və bir çox hafiz tərəfindən əzbərlənmişdir. Yəni Qurani-Kərim Peyğəmbərimiz vəfat etdikdən sonra heç bir bəşər sözünün qarışmaması üçün mühafizə olunmuşdur.
- Qurani-Kərim məntiqən yalan üzrə ittifaq etməsi mümkün olmayan bir camaat tərəfindən zamanımıza qədər təvatür yoluyla nəql olunmuşdur. Bütün surələri, ayələri və kəlmələri vəhylə sabit olmuş və dəyişdirilməmişdir.
- Qurani-Kərim ləfzi ilə ibadət olunan bir kitabdır. Onun ləfzlərindən başqa heç bir sözlə ibadət yerinə yetirilməz.

**B. Qurani-Kərimin adları**

Allah kəlamının “Quran”dan başqa adları da vardır. Bunlar aşağıdakılardır:

الْكِتابُ (Kitab)

الْفُرْقانُ (Furqan): haqla batili, halalla haramı ayıran,

الذِّكْرُ (zikr): Allahı xatırladıb tanıdan,

النُّورُ (nur) : açıq, aydın,

الرُّوحُ (ruh): qəlbləri və ruhları diriltdən,

الْمَوْعِظَةُ (Məviza): öyüd-nəsihət verən,

الشِّفاءُ (Şəfa): şəfa verən,

الْهُدَى (Huda): doğru yolu göstərən,

الْبَيانُ (bəyan): hər şeyi açıqlayan,

الْكَلامُ (kəlam): Allahın sözü,

الرَّحْمَةُ (rəhmət): bütün insanlara rəhmət olması.




**C. Qurani-Kərimin bölmələri**

Qurani-Kərim ümumi olaraq ayə və surələrə bölünmüşdür.

**1. Ayə**

*a) Ayə kəlməsinin mənası*

Ayə kəlməsinin lüğəti mənası “açıq işarə”, “dəlil”, “nişanə” və “möcüzə”dir. Termin olaraq da “bir və ya birdən çox cümlədən meydana gələn, əvvəli və sonu olan kəlam” kimi tərif olunmuşdur.

*b) Ayələrin düzülüşü*

Ayələrin düzülüşü tövqifidir. Yəni hər bir endirilən ayəni Cəbrail (əs) Hz. Muhammədə (s.ə.s.) hansı surənin hansı ayəsindən sonra qoyulacağını bildirmiş, Peyğəmbərimiz də vəhy mələyinin bildirdiyi kimi katiblərinə yazdırmışdır. Burada şəxsi rəy və ictihada yer verilməmişdir. Hz. Peyğəmbər (s.ə.s.) hər yeni enən ayəni namazda oxuyar və daha sonra da onun hökmlərini səhabələrə açıqlayardı.

*c) İlk və son enən ayələr*

İlk enən ayə "Ələq" surəsinin ilk beş ayəsi olduğu haqqında əksər alimlər ittifaq etmişlər. Son enən ayə haqqında isə müxtəlif fikirlər irəli sürülmüşdür. Bu ayələr "Bəqərə" surəsinin 278-ci ayəsi, həmçinin "Bəqərə" surəsinin 281-ci ayəsi, "Nisa" surəsinin 176-cı ayəsi, "Tövbə" surəsinin 128-129-cu ayələri, "Nəsr" surəsinin 1-3-cü ayələri və "Maidə" surəsinin 3-cü ayəsidir.

**2. Surə**

*a) Surə sözünün mənası*

"Surə" sözü lüğətdə "yüksək məqam", "üstün dərəcə", "şan", "şərəf", "binanın mərtəbələri" kimi mənalara gəlir. Termin olaraq isə "ayələrdən meydana gələn, əvvəli və sonu olan müstəqil Quran bölməsi" şəklində tərif olunmuşdur. Quranda 114 surə vardır. Bunlardan ən uzun olanı 286 ayəni özündə birləşdirən "Bəqərə" surəsi, ən kiçiyi də üç ayədən ibarət olan "Kövsər" surəsidir.

Surələrin adları qissələrdə qeyd edilən şəxslərin, cəmiyyətlərin, firqələrin adlarından, əhatə etdikləri mövzulardan  və ya bəzi surələrin əvvəlində olan müqəttəə hərflərindən götürülmüşdür.

Surələr uzunluq və qısalıqlarına görə də dörd qisimdir.  "Fatihə" surəsindən sonra gələn yeddi uzun surəyə "Tival", təxminən yüz  ayəsi olan surələrə "Miun", yüzdən az ayəsi olan surələrə "Məsani", daha kiçik surələrə də "Müfəssəl" adı verilmişdir.

*b) Surələrin tərtibi (düzülüşü)*

Surələrin düzülüşü haqqında alimlər arasında fikir ayrılığı vardır. Bir qisim alimlər surələrin düzülüşünün tövqifi olduğunu, yəni hal-hazırdakı surələrin düzülüşü Hz. Peyğəmbər tərəfindən olduğunu iddia edərkən, bir qisim alimlərə görə, bu tərtib səhabələrin ictihadı ilə olmuşdur.

Səhabələrin ictihadı ilə olmuş olsa da, burada bəzi məqamlar diqqətdən qaçmamalıdır. O da Səhabələrin bu məsələdə ittifaq etdiyi həqiqətidir. Bu o deməkdir ki, səhabə Hz. Peyğəmbərdən surə sıralamasını hal-hazırdakı kimi öyrənmiş və ona görə də bu düzülüşə etiraz edən olmamışdır.

Hz. Osman Hz. Peyğəmbərin son dəfə Hz. Cəbrailə Quranı Qureyş ləhcəsində oxuduğunu əsas gətirərək, Quranın Qureyş ləhcəsində çoxaltdırması da onu göstərir ki, əshab Peyğəmbərimizin Quran xətmini dinləmişdir. Buna görə surə düzülüşünün Hz. Peyğəmbər tərəfindən tərtib edildiyi fikri daha məntiqə uyğundur.

*c) Məkki və Mədəni surələr*

Surələrn Məkki və Mədəni olaraq adlandırılmalarını iki qrupa ayırmaq mümkündür.

1) Vəhyin nazil olduğu məkan əsas götürülərək adlandırılmışdır. Məkkədə və ona yaxın yerlərdə endirilən surələr "Məkki", Mədinə və ona yaxın olan yerlərdə endirilən surələr də "Mədəni" olaraq adlandırılmışdır.  İslam alimlərinin fikrincə, Quranın təxminən 90 surəsi Məkkədə, 24 surəsi isə Mədinədə nazil olmuşdur.



2) Surələr "hicrət" nəzərə alınaraq siniflǝndirilmişdir. Yəni hicrətə qədər nazil olan ayələr Məkki, hicrətdən sonra nazil olan ayələr də Mədəni olaraq adlandırılmışdır.

Birinci fikir Quranı tam əhatə etmədiyinə görə ikinci görüş, fikrimizcə, daha düzgün bir görüşdür. Çünki bütün ayələr Məkkədə və ya Mədinədə, ya da bu şəhərlərdən birinə yaxın olan yerdə endirilməmişdir. Hər iki şəhərdən çox uzaqlarda endirilən ayələr də vardır. Surələrin siniflǝndirilməsində hicrət əsas götürüldüyü zaman isə Quranın hamısı əhatə olunmuş olur. Çünki bütün ayələr ya hicrətdən əvvəl, ya da hicrətdən sonra nazil olmuşdur.

Üslub baxımından da diqqət yetirildiyində görünür ki, hicrətdən əvvəl Məkkədə nazil olan ayələrin üslubu, hicrətdən sonra Məkkədə və ya ona yaxın bir yerdə endirilən ayələrin üslubundan fərqlidir.

Ümumiyyətlə, Məkki ayələr, əsasən, Allahın vəhdaniyyətindən, qiyamət günündən, ölülərin dirilməsindən, eləcə də keçmiş peyğəmbərlərin və onların əshabından, qövmündən geniş bəhs edilmişdir. Həmin surələrdə fəsahət və bəlağət güclüdür. Eyni zamanda bu surələr üslub baxımından nəsr şəklindədir.

Mədəni surələr isə, müsəlman icmasının bir çox dini, hüquqi və əxlaqi ehkamlarını özündə ehtiva etdiyinə görə burada rəsmi üslub üstünlük təşkil edir. Bununla belə, bəzi surələr üslub baxımından çox bəlağətlidir. Mədəni surələrdə münafiqlərdən, onların iç üzlərindən, müsəlmanlara qarşı olan kinindən bəhs olunur. Həmçinin bu surələrdə əhli-kitaba, bütpərəstlərə nəzərən dost mövqedən yanaşılmışdır.

## D. Qurani-Kərimin qorunması ilə bağli alınan tədbirlər

### 1. Quranın yazılması

Hz. Peyğəmbər vəhy yolu ilə aldığı ayələri bir yandan əzbərləyir, bir yandan insanlara təbliğ edir, digər yandan da həmin ayələri katiblərinə yazdırırdı. Bu şəkildə vəhyi yazanlara "vəhy katibləri" deyilirdi. Katiblər yazdıqları ayələri ucadan Rəsulullaha oxuyar, əskiklik və ya artıqlıq varsa Hz. Peyğəmbər onu təshih edərdi. Vəhy katiblərindən olan Zeyd ibn Sabit belə deyir: *"Rəsulullah (s.ə.s.) vəhyi mənə yazdırar, sonra da yazdığımı oxutdurardı. Əgər bir səhvə yol vermişəmsə, onu düzəldərdi. Mən yalnız bu yoxlamadan sonra vəhyi insanlara çatdırardım."*

Hz. Ömərin müsəlman olması ilə nəticələnən hadisədə onun bacısının oxuduğu Məkkədə nazil olan "Taha" surəsinin ilk ayələrinin yazılı olduğu səhifə, vəhyin ilk günlərindən başlayaraq qələmə alındığını göstərən qüvvətli bir dəlildir.

Yazılmış Quran mətnlərinin əsli Hz. Peyğəmbərin evində saxlanırdı. Amma bəzi səhabələr şəxsi olaraq da Quran ayələrini yazaraq evlərində saxlayırdılar.

Vəhy katibləri ayələri aşılanmış dərilərə, kürək sümüklərinə, qabığı soyulmuş xurma budaqlarına, daşlara, taxtadan düzəldilmiş lövhələr üzərinə yazardılar.

Hz. Peyğəmbər həyatda ikən bütün Quran ayələri bu şəkildə yazılmışdır. Ancaq Peyğəmbərimizin vəfatına kimi vəhy hələ davam etdiyi üçün ayrı-ayrı parçalar üzərində yazılmış bu surələr Peyğəmbərimizin dövründə ardıcıllıqla düzülməmiş, vahid bir cild, kitab halına salınmamışdı.

Aşağıdakı ayələr də Quranın yazıldığını və qorunduğunu sübut edir.

كَلَّا إِنَّهَا تَذْكِرَةٌ فَمَنْ شَاءَ ذَكَرَهُ فِي صُحُفٍ مُكَرَّمَةٍ مَرْفُوعَةٍ مُطَهَّرَةٍ

***"Xeyr!** (Belə yaramaz, bir daha belə etmə)**. Həqiqətən, bu** (ayələr) **bir öyüd-nəsihətdir. Kim istəsə, ondan öyüd alar.** (Bu Quran Allah dərgahında) **çox möhtərəm** (mötəbər) **səhifələrdə** - (qədir-qiymıəti) **yüksək** (şanı uca)**, tərtəmiz səhifələrdədir** (Şeytan onlara toxuna bilməz)**".*** (Əbəsə, 80/11-14)

إِنَّهُ لَقُرْآنٌ كَرِيمٌ فِي كِتَابٍ مَكْنُونٍ لَا يَمَسُّهُ إِلَّا الْمُطَهَّرُونَ

***"**(Sizə oxunan) **bu** (kəlam) **çox qiymətli Qurandır. O, qorunub saxlanılan bir Kitabdadır. Ona yalnız pak olanlar toxuna bilər!"*** (Vaqiə, 56/77-79)

Göründüyü kimi yuxarıda qeyd olunan ayələr Quranın yazıldığını və Allah tərəfindən qorunduğunu bildirir.

### 2. Quranın əzbərlənməsi

Hz. Peyğəmbər (s.ə.s.) nazil olan ayələri yazdırmaqla yanaşı onu həm də əzbərləyirdi. Qurani-Kərimdə bu haqda belə buyurulur:

سَنُقْرِئُكَ فَلَا تَنْسَىٰ إِلَّا مَا شَاءَ اللَّهُ إِنَّهُ يَعْلَمُ الْجَهْرَ وَمَا يَخْفَىٰ

*"(Ya Peyğəmbər!) **Biz sənə** (Quranı) **oxudacağıq və sən** (onu) **unutmayacaqsan; Yalnız Allahın dilədiyindən** (hökmünü ləğv etdiyimiz bu və ya digər ayədən) **başqa! Şübhəsiz ki, O, aşkarı da, gizlini də bilir!".*** (Əla,87/6-7)




Bu ayə gələn vəhyin Hz. Peyğəmbərə Allah-Təala tərəfindən əzbərlədiləcəyini və onu unutmayacağını bildirir. Eyni zamanda, ikinci ayədə “Allahın dilədiyindən başqa” deyərək bəzi ayələri istisna etmişdir. Bu məsələ ilə bağlı “Quran elmləri” bölməsində “Nasix və mənsux” başlığı altında ətraflı məlumat verilmişdir.

Həmçinin aşağıdakı ayədə də Quranın Hz. Peyğəmbərə Uca Allah tərəfindən əzbərlədiləcəyi bildirilir.

لَا تُحَرِّكْ بِهِ لِسَانَكَ لِتَعْجَلَ بِهِ إِنَّ عَلَيْنَا جَمْعَهُ وَقُرْآنَهُ فَإِذَا قَرَأْنَاهُ فَاتَّبِعْ قُرْآنَهُ

***“****(Ya Peyğəmbər! Cəbrail sənə Quran oxuduğu zaman)* ***onu tələm-tələsik əzbərləmək üçün dilini tərpətmə!*** *(Sən də onunla birlikdə Quranı təkrar etmə, yalnız dinlə!)* ***Çünki onu*** *(sənin qəlbində)* ***cəm etmək,*** *(dilində)* ***oxutmaq Bizə aiddir. Biz onu*** *(Cəbrailin dili ilə)* ***oxutduğumuz zaman oxunmasını diqqətlə dinlə!”*** (Qiyamə,75/16-18)

Bu ayələrdə göründüyü kimi Peyğəmbərimiz Hz. Muhamməd (s.ə.s.) Quran ayələrini unutma qorxusu daşımış və onu əzbərləmək üçün bir yandan vəhy mələyini dinləmiş bir yandan da gələn vəhyi əzbərləməyə çalışmışdır. Amma Allah-Təala burada Hz. Peyğəmbərə gələn vəhyi əzbərləmək üçün həyəcanlanmamağı bildirmiş və gələn vəhyi Onun qəlbinə yerləşdirib əzbərlədəcəyinin təminatını vermişdir.

Bütün bunlarla yanaşı səhabələr də ayələri əzbərləməyə səy göstərirdilər. Onlardan kimisi Qurandan bəzi surələri, kimisi də Quranın hamısını əzbər bilirdilər. Hz. Peyğəmbər səhabələrə gündəlik ibadətlərində lazım olan qədər surələrdən artıq əzbərləmələrini məcbur etmirdi. Ancaq Quranı əzbərləyənin üstün dərəcələrə nail olacağını bildirməklə onları Quran əzbərləməlęyə həvəsləndirirdi. Uhud savaşında şəhid olan səhabələrdən ən çox Qurandan surə əzbərləyəni birinci dəfn etməsi də bunun misallarındandır.

Beləliklə, Quran həm yazılı şəkildə, həm də hafizələrdə mühafizə edilmişdir.

Hz. Peyğəmbər ildə bir dəfə Ramazan ayında o vaxta kimi gələn ayələri Hz. Cəbraillə birlikdə oxuyardı. Bu oxunuşa “müqabilə” deyilir. Peyğəmbərimiz vəfat etdiyi il Cəbrail (əs) Quranı Hz. Peyğəmbərlə birlikdə iki dəfə oxumuşdu. Beləliklə, Quranın hamısı, “Fatiha” surəsindən “Nas” surəsinə qədər sonuncu dəfə yoxlamadan keçirilmişdir.

### 3. Quranın Kitab halına gətirilməsi

Peyğəmbərimizin vaxtında vəhy davam etdiyi üçün Quran iki qapaq arasında bir kitab olaraq hazırlanmamışdı. Vəhy kəsildikdən qısa müddət sonra Peyğəmbərimizin vəfat etməsi Quranın kitab halına gətirilməsinə imkan verməmişdi. Beləliklə, bu şərəfli iş səhabələrin öhdəsinə buraxılmışdı. Quranın qorunub saxlanmasında, onun ayələrinin itməməsində ən böyük təminatçı olan Rəsulullahın vəfat etməsi Quran səhifələrinin bir yerə toplama fikrini əshabın ağılına gətirməmişdi.

Ancaq Yəmamə savaşında çoxlu sayda Quran hafizinin şəhid olması Hz. Öməri narahat edir və bunun nəticəsində xəlifə Hz. Əbu Bəkrin yanına gələrək hafizlərin şəhid olmasının Quran ayələrinin itməsinə səbəb ola biləcəyini, buna görə də ən qısa zamanda bütün Quran səhifələrinin bir araya toplamağın lazım olduğunu söyləyir. Əvvəlcə Hz. Əbu Bəkr Rəsulullahın etmədiyi bir işi

etməyin düzgün olmadığını deyərək, Hz. Ömərə etiraz edir. Ancaq çox keçmədən Hz. Ömərin fikrinin düzgün olduğunu görüb onun məsləhətini bəyənmişdir.



Qurani-Kərimin çoxaldılmasına nə üçün ehtiyac duyulduğunu yoldaşlarınızla müzakirə edin.

Daha sonra Hz. Əbu Bəkr vəhy katiblərini və eyni zamanda hafiz olan Zeyd ibn Sabiti çağırtdıraraq Quranın cəmi barəsindəki fikirlərini onunla bölüşür. Bu hadisəni Zeyd b. Sabit belə anladır: "Yəmamə müharibəsində çoxlu sayda hafiz olan səhabələrin öldürülməsindən sonra Əbu Bəkr məni çağırtdı. Yanına gedəndə Ömər də orda idi. Əbu Bəkr mənə dedi: "Ömər mənə: Yəmamə savaşında bir çox Quran hafizi şəhid oldu. Belə hadisələr təkrarlanarsa Quranın bir çox hissəsinin itməsindən ehtiyatlanıram. Fikrimcə, Quranın bir yerə toplanması üçün əmr verməlisən!" -dedi. Mən də Ömərə belə cavab verdim: "Rəsulullahın etmədiyi bir işi necə edək?" Ömər: "Allaha and olsun ki, bu xeyirli bir təşəbbüsdür", -dedi. Sonra bu məsələnin üzərində o qədər dayandı ki, axırda Allah mənim də qəlbimi bu işə meyil etdirdi və mən də buna qane oldum".

Bu sözlərdən sonra Əbu Bəkr mənə: "Sən ağıllı və etibarlı bir gəncsən. Rəsulullaha gələn vəhyi yazırdın. Quranı araşdır və bir araya topla!" -dedi. Mən də: "Əbu Bəkr mənə dağlardan birini daşıma vəzifəsini versəydi, bu vəzifədən daha yüngül olardı", -deyə düşündüm. Sonra onlara: "Siz Rəsulullahın eləmədiyi bir işi necə edə bilərsiniz?" -dedim. Əbu Bəkr mənə: "Allaha and içirəm ki, bu xeyirli bir işdir", -dedi. Əbu Bəkr bu işdə israr etdi. Nəhayət, Allah Əbu Bəkrlə Ömərin ağıllarına yatırdığı və ürəklərini fərəhlətdiyi bu işə mənim də ürəyimi yatırdı. Bunun nəticəsində mən də Quranın arxasınca düşüb haqqını verərək araşdırdım və onu yazılı olduğu xurma budaqlarından, incə daş lövhələrdən və hafizlərin əzbərlərindən topladım…

Zeyd ibn Sabit yuxarıda anlatdığı kimi öncə bu işə etirazını bildirsə də, daha sonra bu işin məqsədə uyğun olduğunu görüb bu şərəfli vəzifəni qəbul edir. Daha sonra bütün səhabələrə Hz. Peyğəmbərdən dinləyib yazdıqları Quran mətnlərini gətirmələri əmr olunur.

Beləliklə, Zeyd ibn Sabitin rəhbərliyində hafizlərdən ibarət bir heyət yaradılır. Həmin heyət Peyğəmbərimizin dövründə dəri, sümük, daş və xurma ağacının qabıqları üzərində yazılmış ayələrin hər birini iki mötəbər şəxsin şahidliyi ilə qeydə aldıqdan sonra bunları cild halına saldılar.

Cəm edilən bu səhifələrə Abdullah ibn Məsudun təklifi ilə "Müshəf" adı verilmişdir.

Zeyd ibn Sabit bu şəkildə böyük diqqət və səy göstərərək Quranın bütün ayələrini bir kitab halında toplayaraq Hz. Əbu Bəkrə təhvil verdi. Bu Kitab daha sonra Hz. Ömərə təslim edilmiş, ondan sonra xəlifənin kim olacağı bilinmədiyi üçün də həmin Quran qızı Həfsəyə verilmişdir.

Tarixi mənbələr Zeyd ibn Sabitin topladığı əsas müshəfdən başqa, eyni zamanda, Hz. Əli (r.ə.), Übeyy ibn Kəb, Abdullah ibn Məsud, Miqdad və Əbu Musa əl-Əşəriyə aid şəxsi nüsxələrinin olduğunu xəbər verir.

Quranın kitab halına gətirilməsinə nəyə görə ehtiyac hiss edilmişdir?

Quran səhifələri toplanarkən heç bir ayənin itmədiyini necə izah etmək olar?

QURANIN MÜSHƏF HALINA GƏTİRİLMƏSİNİN MƏRHƏLƏLƏRİ

- M. 610-632: Hz. Peyğəmbərə nazil olması
- M. 632-634: Hz. Ömərin tövsiyəsi, Hz. Əbu Bəkrin təlimatı ilə Zeyd b. Sabit tərəfindən Quran səhifələrinin bir araya toplayaraq iki qapaq arasında müshəf olaraq toplanması
- M. 644-656 Hz. Osmanın əmri və Zeyd b. Sabitin rəhbərliyi ilə Quranın çoxaldılması
- Zeyd b. Sümeyyənin (675) təlimatı ilə Əbül-Əsvəd əd-Düəli (688) tərəfindən Quranın hərəkələnməsi
- Həccac b. Yusifin (714) əmri ilə Yəhya b. Yəmər (746) və Nəsr b. Asim (707) tərəfindən Quranın nöqtələmə işarələrinin qoyulması
- Xəlil b. Əhmədin (751) hərəkə və nöqtələri təkmilləşdirərək sonlandırması.

Bu Müshəfin xüsusiyyətləri aşağıdakılardır:

1. Cəm etmə fəaliyyəti, elmi metodlarla həyata keçirilmişdir,
2. Tilavəti mənsux olan ayələr yazılmamışdır,
3. Bu mushaf yeddi hərfi əhatə edirdi,
4. Müshəfdə yer alan bütün ayələr təvatür yolu ilə bizə nəql olunduğuna dair ümmət icma etmişdir,
5. Müshəfdə yer alan ayələr nazil olma ardıcıllığına görə yox, Rəsulullahın son olaraq bildirdiyi ardıcıllığa görə və aid olduqları surələrə yazılmışdır.

**4. Quranın Hz. Osman dövründə çoxaldılması**

Hz. Ömərin vaxtında İslam dövlətinin sərhədləri genişlənmiş, Hz. Osmanın vaxtında isə daha da böyümüşdür. Fəth olunan yeni yerlərə əshabdan Quranı yaxşı bilənlər gedir, yeni müsəlman olanlara şəxsi nüsxələrindən Quranı öyrədirdilər. Ancaq bu şəxsi nüsxələr arasında qiraət fərqlilikləri olduğu üçün müsəlmanlar tərəfindən tam anlaşılmır, buna görə də aralarında ixtilaflar çıxırdı. Bu ixtilaflar zamanla ciddi mübahisələrə çevrildi.

Xəlifə Hz. Osmanın (r.ə.) Quranı çoxaltmasına sövq edən də yuxarıdakı ixtilaflardan biri olan mühüm bir hadisə olmuşdur. Belə ki, məşhur sərkərdə Hüzeyfə bin əl-Yəman suriyalı və iraqlı əsgərlərdən ibarət ordunun başında Azərbaycanda döyüşən zaman şamlılar Übeyy ibn Kəbin, kufəlilər Abdullah bin Məsudun, bəsrəlilər isə Əbu Musa əl-Əşərinin tərtib etdiyi Quranı oxuyur, hərə öz nüsxəsinin, öz qiraətinin düzgün olduğunu iddia edirdi. Hz. Hüzeyfə Mədinəyə qayıtdıqdan sonra Azərbaycanda baş vermiş hadisəni Hz. Osmana danışıb, bu sahədə təcili bir iş görməyin vacib olduğunu bildirərək dedi: “Ey möminlərin əmiri, Quran haqqında yəhudilər və xristianlar kimi ixtilafa düşmədən bu ümmətin imdadına yetiş!”

Bunun müqabilində Hz. Osman Hz. Əbu Bəkr vaxtında Quran ayələrini "Müshəf" olaraq bir araya gətirən Zeyd ibn Sabitin rəhbərliyində dörd nəfərdən ibarət bir heyət təşkil etdi. Bu heyətin vəzifəsi Quranı çoxaltmaq idi. Müshəf aşağıdakı üsullar əsas alınaraq çoxaldılmışdır:

- Hz. Əbu Bəkr vaxtında toplanan Müshəf əsas alınmış,
- Rəsulullahın (s.ə.s.) Cəbrailə (əs) son dəfə oxuduğu qiraət əsas götürülərək yerdə qalan altı hərf tərk olunmuş,
- Heyət içində ləhcədə ixtilaf çıxdığı zaman Qüreyş ləhcəsi əsas alınmış,
- Təfsir və şərh məqsədi ilə əlavə qeydlər yazılmış,
- Bir neçə nüsxə yazılaraq müxtəlif bölgələrə göndərilmiş, şəxsi adamlarda olan müshəflər və ya səhifələr aradan qaldırılmışdır.

Heyət bu minvalla yeddi nüsxə yazmışdır. Hz. Osman bu nüsxələrdən birini Mədinədə saxlayıb digər altısını İslamın altı bölgəsinə göndərmişdir. Bir də bu Quranı oxutmaq üçün həmin bölgələrə müəllimlər göndərmişdir.

Bundan sonra Hz. Osman ixtilaf çıxmasın deyə səhabə arasında özəl nüsxələri topladaraq yox etdirmişdir.

**E. Qurani-Kərimin nöqtələnməsi və hərəkələnməsi**

Hz. Osman dövründə çoxaldılan müshəflər hərəkəsiz və nöqtəsiz idi. Müxtəlif hərflərin sadəcə nöqtələrlə bir-birindən ayrıldığını fikirləşəndə qeyri-ərəb olan müsəlmanların Quranı çox çətinliklə oxuyub başa düşdüklərini daha yaxşı başa düşmək olar. Səhabələr üçün isə Quranı oxumaq çətin deyildi. Çünki onlar Quranı həm Hz. Peyğəmbərdən dinləmişlər, həm də ayələr onların dilində ərəbcə idi. Bunun üçün hərflər nöqtəsiz və hərəkəsiz də olsa, Quranı düzgün oxuyurdular. Ancaq daha sonra İslam dövlətinin sərhədləri genişləndikdən sonra yeni müsəlman olanlar ərəb dilini bilmədikləri üçün Quranı oxumaqda çətinlik çəkməyə başladılar.



Bu məsələni həll etmək üçün İraq valisi Ziyad ibn Sümeyyə (ö. 53/673) Əbül-Əsvəd əd-Düəlidən (ö. 69/688) kömək istədi. Əbül-Əsvəd bu işin əhəmiyyətini bir nəfərin “və rasuluhu” kəlməsini “və rasulihi” kimi oxuduğunu, belə olanda da  “Allah və Rəsulu müşriklərdən uzaqdır” şəklindəki mənanın “Allah Rəsulundan və müşriklərdən uzaqdır” mənasına gəldiyini görəndə daha yaxşı anladı. Bundan sonra Qurani-Kərim Əbül-Əsvəd əd-Düəli tərəfindən başdan sona qədər hərəkələnmişdir.

Bu iş, sadəcə, hərflərə hərəkə qoymaqdan ibarət olduğu üçün Quranın oxunmasında yaranan çətinlik nisbətən ortadan qalxsa da, tam həllini tapmadı. Çünki əsas məsələlərdən biri olan oxşar hərfləri bir-birindən ayırmaq isə problem olaraq qalırdı. Məhz bu səbəbdən İraq valisi Həccac ibn Yusif (ö.95/713) bu məsələni həll etmək üçün Yəhya ibn Yəmər (ö.129/746) və Nəsr ibn Asimi (ö.89/707) vəzifələndirmişdir. Onlar da hərflərin nöqtələnməsi ilə məşğul olmuşlar. Beləliklə, Qurani-Kərimin oxunmasında çətinliyə səbəb olan hərflərə nöqtələr qoyularaq bu problem də öz həllini tapdı.

Daha sonra Xəlil ibn Əhməd (ö.175/791) hal-hazırda istifadə etdiyimiz hərəkə və nöqtələmə işarələrini təkmilləşdirmişdir.

## BİRİNCİ FƏSLƏ AİD SUALLAR

1. *Vəhyin lüğət və termin mənaları izah edin.*
2. *Vəhy hansı şəkillərdə nazil olmuşdur?*
3. *Qurani-Kərimin mənasını açıqlayın.*
4. *Qurani-Kərim hansı yollarla qorunmuşdur?*
5. *Surə nə deməkdir? Quranda neçə surə var?*
6. *Ayələrin düzülüşü haqqında məlumat verin.*
7. *İlk enən ayələr hansılardır?*
8. *Qurani-Kərim hansı xəlifənin dövründə kitab halına gətirilmişdir?*
9. *Bir araya gətirilən müshəfin xüsusiyyətlərini sadalayın.*
10. *Qurani-Kərim hansı xəlifənin dövründə çoxaldılmış və buna nə səbəb olmuşdur?*
11. *Qurani-Kərim çoxaldılarkən hansı əsaslar nəzərə alınmışdır?*

**Aşağıdakı sualların düzgün cavablarını işarələyin.**

***1. Qurani-Kərim hansı səhabənin rəhbərliyində çoxaldılmışdır?***

A) Hz. Əbu Bəkr

B) Hz. Ömər

C) Hz. Osman

D) Hz. Zeyd ibn Sabit

***2. Qurani-Kərimin adlarından biri olub mənası "haqq ilə batili bir birindən ayıran" mənasına gələn ad hansıdır?***

A) əz-Zikr

B) əl-Kitab

C) əl-Mevizə

D) əl-Furqan

E) əl-Hüda

***3. Qurani-Kərimə ilk dəfə hərəkəni kim qoymuşdur?***

A) Ziyad ibn Sümeyyə

B) Əbül-Əsvəd əd-Düəli

C) Xəlil ibn Əhməd

D) Nəsr ibn Asim

E) Yəhya ibn Yəmər

***4. Aşağıdakılardan hansına "imam müshəfi" deyilir?***

A) Hz. Peyğəmbərin vaxtında olan müshəfə

B) Hz. Əbu Bəkrin əmri ilə bir araya gətirilən müshəfə

C) Hz. Osmanın vaxtında çoxaldılıb Mədinədə saxlanılan mushafa

D) Kufəyə göndərilən müshəfə

E) Məkkəyə göndərilən müshəfə

***5. Quranın Peyğəmbərimizin (s.ə.s.) vaxtında yazılışıyla əlaqədar aşağıda verilən fikirlərdən hansı doğru deyildir?***

A) Enən vəhy iki qapaq arasında toplanmışdı

B) Enən ayələr əzbərlənməklə bərabər yazılırdı

C) Ayələr müxtəlif əşyalar üzərinə yazılırdı

D) Vəhyi yazan xüsusi katiblər vardı

E) Vəhy  yazıldıqdan sonra Hz. Peyğəmbər tərəfindən dinlənir, səhvlər varsa düzəldilirdi

***6. Aşağıdakılardan hansı vəhyin gəliş şəkillərindən biri deyil?***

A) İlham yolu ilə gəlməsi

B) Mələyin öz surətində gəlməsi

C) Namaz qılarkən gəlməsi

D) Səsli gəlməsi

E) Mələyin insan surətində gəlməsi

**Aşağıdakı cümlələrdə nöqtələrin yerinə verilən kəlmələrdən düzgün olanını qoyun.** ***(Təmim, müqabilə, pərdə arxasından, Qureyş, vəhylə, bir elçi)***

Hz. Peyğəmbərin hər il Ramazan ayında Quranı Hz. Cəbrail ilə qarşılıqlı oxumalarına .......... ...............................deyilir.

Quran çoxaldılarkən ixtilaf olan məsələdə ............................. ləhcəsi əsas alınmışdır.

Allah bəşər övladı ilə ancaq ................., yaxud .................... danışar. Və ya ................ göndərər ki, o da Allahın izni ilə Onun istədiyini vəhy edər.



# II FƏSİL
# TƏFSİR ELMİ VƏ ƏSAS MƏFHUMLARI

**HAZIRLIQ TAPŞIRIQLARI**

1. Təfsir, təvil, tərcümə və məal kəlmələrinin kəlmə və termin mənalarını kitablardan araşdırın.
2. Təfsir elminin ortaya çıxış səbəbi haqqında düşünün.
3. Qurani-Kərimin ayələrinin təfsir edilməsinin nə kimi faydaları var? Araşdırın.
4. Təfsirin bir elm kimi formalaşmasında əsas amillər hansılardır?
5. Təfsir elminin mənbələrindən bir neçəsini əzbərləməyə çalışın.

## I TƏFSİR, TƏVİL, TƏRCÜMƏ, MƏAL

### A. Təfsir

Təfsir Ərəb dilində "fə-sə-ra" feilindən törəmiş bir məsdərdir. "Lüğətdə" kəşf etmək, ortaya çıxarmaq, açıqlamaq kimi mənalara gəlir.

Termin mənası isə: "Səlahiyyətli alimlərin Qurani-Kərimin ayələrini Ərəb dili və ədəbiyyatı baxımından təhlil edərək müəyyən əsaslara görə açıqlamalarıdır".

Təfsir elmi "Qurani-Kərimin ayələrini insanların anlaya bildiyi şəkildə açıqlayan, ayələrdə keçən qapalı ləfzlərdən murad edilən mənanı izah edən elmdir". Bu elmlə məşğul olan kimsəyə "müfəssir" deyilir.

Qurani-Kərimin ilk müfəssiri Hz. Peyğəmbərdir. O, uca Allahdan aldığı vəhyi insanlara çatdırmış və qaranlıq qalan məsələləri onlara izah etmişdir. Hz. Peyğəmbərə verilən bu vəzifə Qurani-Kərimdə belə bildirilmişdir:

**Qurani-Kərimin məalini oxuyarkən diqqət edilməlidir:**

» Hər şeydən əvvəl məal oxumağın əhəmiyyətini dərk etmək lazımdır. Çünki Allah-Təalanın sözünə müxatəb olmaq və onu anlamağa çalışmaq mühüm əhəmiyyət kəsb edir.

» Qurandakı bəzi ayələrin məqsədlərinin anlaşılması mütəxəssislik tələb edir. Bu səbəbdən oxucu bu cür ayələri anlamağa çalışarkən mövzu ilə əlaqədar təfsir kitablarına və ya həmin sahənin mütəxəssislərinə müraciət etməlidir.

» Quranın özünə məxsus izah tərzi vardır. Ümumiyyətlə, eyni mövzu ilə əlaqədar ayələr bir arada verilməz. Bu səbəbdən oxucu Quranın məalini oxuyarkən ayələrlə əlaqəli qeydlər alması və eyni mövzudakı ayələri birlikdə dəyərləndirməsi mühümdür.

...وَأَنزَلْنَا إِلَيْكَ الذِّكْرَ لِتُبَيِّنَ لِلنَّاسِ مَا نُزِّلَ إِلَيْهِمْ وَلَعَلَّهُمْ يَتَفَكَّرُونَ

***"...Sənə də Quranı nazil etdik ki, insanlara onlara göndəriləni** (hökmləri, halal-haramı) **izah edəsən və bəlkə, onlar da düşünüb dərk edələr!"*** (Nəhl 16/44)

Qurani-Kərimin açıqlanması prosesində tarix boyu təfsir sözündən əlavə başqa kəlmələrdən də istifadə olunmuşdur. Bu kəlmələrin hər biri Qurani-Kərimin açıqlanması üçün istifadə edilir. Ancaq bu ifadələrin öz aralarında müəyyən fərqlilikləri vardır. Bu kəlmələri bir-bir aşağıda izah edək:

**B. Təvil**

Təvil Ərəb dilində "Əvl" sözündən götürülüb "əslinə qaytarmaq", "hər hansı bir şeyi çatacağı yerə çatdırmaq" mənalarına gəlir.

Termin mənası isə təvil "bir sözün ehtimal edilən mənalarından birini əsas götürərək o sözlə bağlı həqiqi mənanı əldə etməkdir". Müfəssir təvil edərkən ayənin ehtimal edilən mənalarından birini əsas götürür. Bu işi icra edərkən əsil mənanı əldə etmək üçün müəyyən bir üsulu təqib edir.

Təfsir və təvil əvvəllər eyni mənalarda işlədilmişdir. Daha sonralar isə fərqli mənalarda işlədilməyə başlanmışdır. Bu ikisi arasındakı fərqləri qısa şəkildə aşağıda göstərək:

- Təfsir qətiyyət ifadə edir. Çünki təfsir Hz. Peyğəmbərdən və səhabələrdən gələn rəvayətləri əsas götürür. Təvil isə qətiyyət ifadə etmir. Çünki təvil alimlərin ictihadına söykənir.
- Təfsir çoxu vaxt ayələrin ləfzlərində, təvil isə mənalarında olur.
- Təfsir həqiqət yolu ilə ləfzlərin zahir mənalarını, təvil isə onların dərin mənalarını açıqlayır.
- Təfsirdə doğruluq olduğu üçün daima mötəbər qəbul olunur. Təvil isə bəzən mötəbər sayıldığı kimi yerinə görə mötəbər sayılmaya bilər. Başqa sözlə, təfsirdə dəqiqlik, təvildə isə qeyri-dəqiqlik vardır.

**C. Tərcümə**

Tərcümə sözü ərəbcə bir kəlmə olub, lüğətdə mənası "hər hansı bir dildəki sözü başqa bir dildə mənalandırmaq", "bir sözü başqa bir dildə izah etmək" deməkdir. Termin olaraq tərcümə "hər hansı bir dildəki söz və ya kəlamın eynilə başqa bir dildəki bənzəri ilə ifadə etməkdir". Tərcümə işi ilə məşğul olan şəxsə də "mütərcim" deyilir.

Tərcümə məfhumu "ləfzi" (hərfi) və "mənəvi" (təfsiri) olmaqla iki qismə ayrılır.

1. Ləfzi (hərfi) tərcümə: bir mətnin bütün xüsusiyyətləri ilə bir dildən başqa bir dilə eyni ilə tərcümə edilməsinə "ləfzi" (hərfi) deyilir. Bu, hər bir kəlmənin digər dildəki tam qarşılığının tərcüməsi ilə gerçəkləşir.

2. Mənəvi (təfsiri) tərcümə: bir mətni sadəcə kəlmələrinə bağlı qalmadan bəzi şərh və izahlar-la bir dildən başqa bir dilə nəql edilməsinə "mənəvi" (təfsiri) tərcümə deyilir.

Qurani-Kərimin tərcüməsi məsələsində alimlər fərqli fikirlər ortaya qoymuşlar. Ancaq hamısı Qurani-Kərimi hərfi tərcümə etməyin mümkün olmadığı barədə uzlaşmışlar. Bunun əksinə təfsiri tərcümənin edilməsinin mümkün olduğunu bildirmişlər. Çünki bu cür tərcümədə ləfzin mənası daha geniş bir şəkildə izah olunur.

**D. Məal**

Məal sözü də təvil sözü kimi ərəb dilində "əvl" kökündən törəmişdir. Məal kəlməsi "nəticə", "bir şeyin nəticəsi, xülasəsi" deməkdir. Bu kəlmə "bir sözün mənasına yaxın məna vermək" anlamına da gəlir. Termin olaraq da Qurani-Kərimin qısa açıqlamalarla başqa bir dilə çevrilməsidir.

Qurani-Kərimi tərcümə və təfsir etmək mümkün olsa da, onu bütün incəlikləri ilə mükəmməl olaraq tərcümə etmək mümkün deyildir. Buna görə də alimlər Qurani-Kərimin tərcüməsinə tərcümə deyil, "məal" demişlər.



**II TƏFSİR ELMİNİN MƏQSƏDİ**

Müqəddəs kitabımız Qurani-Kərim insan oğlunun ehtiyac duyduğu dünya və axirət ilə bağlı bütün hökmləri ehtiva edir. Bu dərin mənbədən hər fərd və cəmiyyət öz imkan və qabiliyyəti ölçüsündə istifadə edib ehtiyaclarını qarşılamalıdır. Qurani-Kərim insana getdiyi yolda bələdçilik edər və onu doğru yola yönləndirər. Bu yönləndirməni insan doğru şəkildə qavramalı və ondan lazımi nəticəni əldə etməlidir. Qurani-Kərim, eyni zamanda, həyatda qarşılaşılan hər bir problemin həll yollarını göstərən və hər dərdə şəfa verən ilahi bir kitab olduğuna görə mükəmməl qavranılmalıdır.

Qurani-Kərim endirildiyi gündən bu yana daima oxunulan və açıqlanmağa ehtiyac duyulan bir kitabdır. Amma Quranın ayələri zaman zaman yanlış təfsir edilmişdir. Bunun səbəbi də insanların bilik və qabiliyyətlərinin fərqli olmasıdır. Buna görə Qurani-Kərimin müsəlmanlar tərəfindən doğru bir şəkildə anlaşılması üçün açıqlanmasına ehtiyac vardır. Bu ehtiyacı aradan qaldırmaq üçün məhz elə təfsir elmi meydana çıxmışdır.

**III TƏFSİR ELMİNİN ƏHƏMİYYƏTİ**

Hər insan Allahın kitabının endirildiyi dil olan Ərəb dilindən oxumaq və anlamaq imkanına malik deyil. Bu səbəbdən Quran Ərəb dilini bilməyənlər üçün fərqli dillərə tərcümə edilmişdir. Bu tərcümələr Qurani-Kərimi başa düşmək üçün önəmli bir addım olsa da, Quranın tam olaraq anlaşılmasında kifayət etməmişdir. Çünki Quran ləfz və məna dərinliyi ilə misilsiz bir əsərdir.

Onun mənasının və ədəbi incəliklərinin anlaşılması üçün təfsirə ehtiyac olmuşdur. Bunun üçün Qurani-Kərimin bir çox ayəsində Allahın sözləri üzərində dərindən düşünməyimiz tələb olunur. Bu barədə Allah-Təala buyurur:

أَفَلَا يَتَدَبَّرُونَ الْقُرْآنَ أَمْ عَلَىٰ قُلُوبٍ أَقْفَالُهَا

***Onlar Quran barəsində düşünməzlərmi? Yoxsa ürəklərinə kilid vurulmuşdur?*** *(Yoxsa ürəklərinin öz kilidləri vardır?)* (Muhamməd, 47/24)

Bu cür ayələr Quranın açıqlanması vacib olan bir kitab olduğunu açıq-aydın göstərir. Quranın ilk və ən səlahiyyətli müfəssiri olan Hz. Peyğəmbərlə başlayan təfsir fəaliyyətləri onun vəfatından sonra da davam etmiş və zaman içərisində bir elm halına gələrək günümüzə qədər çatmışdır. Belə ki, ilk müsəlmanlar Qurani-Kərimi öz dillərində olduğu üçün rahat anlayırdılar. Eyni zamanda onlar ayələrin nazil olma səbəblərini də bilirdilər. Bəzən anlamadıqları məsələləri dərhal Hz. Peyğəmbərimizdən soruşub öyrənirdilər.

Hz. Peyğəmbərimizin vəfatından sonra Qurani-Kərim ayələrinin təfsir edilmə ehtiyacı hasil oldu. Çünki İslam dini sürətlə ətraf bölgələrə yayılır, Ərəb olmayan müsəlmanlar isə onun dilini bilmirdilər. Bundan əlavə, bu insanların ayələrin mənalarını doğru anlamaları üçün vəhyin gəldiyi mühiti və ayələrin nazil olma səbəblərini bilmələri qaçılmazdı. Bu müddət içərisində təfsir elmi daha əhatəli və müstəqil bir elm halına gəlməyə başladı.

Təfsir elmi ehtiva etdiyi bölmələrlə Qurani-Kərimi bütün yönləri ilə incələyir və onun üslubunu açıqlayır. Kəlmələrin və ifadələrin həqiqi, məcazi, kinayəli mənalarını göstərir, məna baxımından qapalı ləfzləri aydınlaşdırır. Qissələrə, müxtəlif hadisələrə dair yetərli bilgi verir, Quranda yer alan ərəbcə olmayan kəlmələri, eynimənalı ifadələri tədqiq edir. Ayələrin nazil olma səbəblərini, nasix və mənsuxunu açıqlayır. Beləliklə, Quranın rahat və doğru anlaşılması üçün çox mühüm rol oynayır.

## IV TƏFSİR ELMİNİN MƏNBƏLƏRİ

Təfsir elminin nə vaxt ortaya çıxması barədə dəqiq bir məlumat yoxdur. Ancaq mənbələrin bildirdiyinə görə, hicri tarixi ilə II əsrdən etibarən təfsir elmi ilə əlaqədar məlumatlar bir araya gətirilməyə, tam əhatəli olmasa da, bəzi mövzulara dair kitablar yazılmağa başlanmışdır. Ancaq təəssüflər olsun ki, həmin nüsxələr bu gün bizə gəlib çatmamışdır. Daha sonrakı dövrlərdə təfsir elmi getdikcə kamilləşmiş və bu elmlə bağlı mükəmməl əsərlər təlif edilməyə başlanmışdır.

Bilindiyi kimi dini elmlərin dili ərəbcə olduğuna görə təfsir elmi sahəsində də yazılan əsərlərin əksəriyyəti ərəbcə yazılmışdır. Ancaq müəyyən müddət keçdikdən sonra türk və Avropa dillərində də təfsir elmi ilə əlaqədar qiymətli kitablar yazılmışdır. Biz burada, əsasən İslam dünyasında ən məşhur olan bəzi ərəbcə, türkcə və qərb dillərində əsər yazan alimlərə və onların əsərlərinə nəzər yetirək:

### a. Ərəbcə mənbələr

1. əz-Zərkəşi (ö. 794/1392), "əl-Bürhan fi Ülumil-Quran";
2. əs-Süyuti (ö. 911/1505), "əl-İtqan fi ülumil-Quran";
3. əz-Zərqani (ö. 1367/1948), "Mənahilül-irfan fi ülumil-Quran";
4. əz-Zəhəbi (ö. 1399/1978), "ət-Təfsir vəl-müfəssirun";

5. Subhi Salih (ö. 1399/1978), “Məbahis fi ülumil-Quran”.
6. Mənnaul-Qattan (ö. 1393/1973), “Məbahis fi ülumil-Quran”.

**b. Türkcə mənbələr**

1. Ömər Rıza Doğrul (ö. 1372/1952), “Quran nədir?”.
2. Ömər Nəsuhi Bilmən (1391/1971), “Böyük təfsir tarixi”.
3. İsmail Cərrahoğlu, “Təfsir üsulu”
4. Əli Turgut (ö. 1412/1991), “Təfsir üsulu və qaynaqları”.

**c. Qərb dillərindəki bəzi mənbələr**

1. Ignaz Goldziher, “De Richuntgen der İslamichen Koranauslegung”.
2. Rudi Paret, “Quran üzərinə məqalələr”.
3. T. Nöldəkə - F. Schwlly, “Quran Tarixi”.

## İKİNCİ FƏSİLƏ AİD SUALLAR

**Aşağıdakı suallara izahlı cavablar verin.**

1. Təfsir elminin tərifini, əhəmiyyətini və məqsədini izah edin.

2. Təfsir və təvilin arasındakı əsas fərqləri izah edin.

3. Tərcümə və məalin xüsusiyyətləri barədə məlumat verin.

4. Quran tərcümələrinin arasındakı bəzi fərqliliklərin səbəblərini açıqlayın.

5. Qurani-Kərim başqa bir dilə tam tərcümə edilə bilərmi? Ətraflı izah edin.

**Aşağıdakı sualların düzgün cavablarını işarələyin.**

***1. Qurani-Kərimin qısa açıqlamalarla başqa bir dilə çevrilməsinə nə deyilir?***

A) Təfsir

B) Tərcümə

C) Məal

D) Haşiyə

E) Təvil

***2. Aşağıdakılardan hansı təvilin xüsusiyyətlərindən deyil?***

A) Təvil ayələrin mənalarında olur.

B) Təvil Hz. Peyğəmbərdən və səhabələrdən gələn rəvayətləri əsas götürdüyü üçün qətiyyət ifadə edir.

C) Təvil bəzən mötəbər sayıldığı kimi, yerinə görə mötəbər sayılmaya bilər.

D) Təvil Qurani-Kərimin ayələrinin dərin mənalarını açıqlayır.

***3. Bir mətni başqa bir dilə heç bir açıqlama etmədən tərcümə etməyə nə deyilir?***

A) Təfsir

B) Məal

C) Tərcümə

D) Təvil

***4. Mətni, sadəcə, kəlmələrə bağlı qalmadan bəzi şərh və izahlarla bir dildən başqa bir dilə nəql edilməsinə nə deyilir?***

A) Təvil

B) Mənəvi tərcümə

C) Təfsir

D) Haşiyə

E) Ləfzi tərcümə

***5. Aşağıdakılardan hansı tam olmayan tərcüməni ifadə edir?***

A) Təvil

B) Məal

C) Hərfi tərcümə

D) Şərh

E) Təfsir

***6. Aşağıdakılardan hansı təfsir elmi sahəsində yazılan ərəbcə mənbələrdəndir?***

A) Ömər Nəsuhi Bilmən, "Böyük təfsir tarixi"

B) Sübhi Saleh, "Məbahis fi ülumil-Quran"

C) Rudi Paret, "Quran üzərinə məqalələr"

D) Əli Turgut, "Təfsir üsulu və qaynaqları"

E) Ömər Rıza Doğrul (ö. 1372/1952), "Quran nədir?"



# III FƏSİL
# QURAN ELMLƏRİ

**HAZIRLIQ TAPŞIRIQLARI**

1. Quran elmlərinin meydana çıxmasından əvvəlki nəsil (səhabələr) ondan necə istifadə edirdilər? Öyrənin.

2. Quran elmlərinin meydana çıxması hansı ehtiyaca görə baş vermişdir? Araşdırın.

3. Qiraət firqlilikləri bizim Quranı oxumamızda hansı rolu oynadığı barədə məlumat verin.

4. Quranda anlaşılmayan kəlmələrin və ifadələrin neçə növü var? Araşdırın.

5. “Ali-İmran” surəsinin 7-ci ayəsinin açıqlamasını hər hansı bir təfsir kitabından öyrənin.

## I. QURAN ELMLƏRİ

Qurani-Kərim Allah-Təala tərəfindən insanlara dünya və axirət işlərini islah etmələri məqsədilə endirilmişdir. Odur ki, hər bir müsəlman Quranda ona aid olan din və dünya işləri haqqındakı ayələrdən xəbərdar olmalıdır.

Quranın endirildiyi dövrdə yaşayan insanlar onların dilində nazil olan ayələri təbii olaraq anlayırdılar. Buna baxmayaraq bəzən onların belə başa düşə bilmədikləri ayələr olurdu. Belə ayələri Hz. Peyğəmbərdən soruşar, Peyğəmbərimiz də həmin ayələrdən Uca Allahın muradının nə olduğunu onlara açıqlayardı. Məsələn, ***“İman edib imanlarına zülm qarışdırmayanlara gəldikdə, bax əsil onlar qorxudan və əzabdan qurtulmuş və hidayətə gəlmişlərdir”*** ayəsi nazil olanda müsəlmanlar Peyğəmbərimizə gələrək: *“Ey Allahın rəsulu, bizim hansımız özümüzə zülm etmirik ki?”* -deyə soruşanda Hz. Peyğəmbər (s.ə.s.) belə cavab verdi: *“Buradakı zülm sizin fikirləşdiyiniz zülm deyil”. Burada Loğmanın (əs) oğluna: “Övladım! Allaha şərik qoşma, çünki şirk ən böyük zülmdür sözündəki zülm (şirk) qəsd olunmuşdur”.*

Hz. Peyğəmbərin ancaq bu açıqlamasından sonra səhabələr burada bəhs olunan zülmün “şirk” olduğunu bilmişlər.

Hz. Peyğəmbər (s.ə.s.) bəzən müxtəlif mənalara gələn kəlmələri izah etmiş, bəzən təşbehləri açıqlamış, bəzən qərib kəlmələrə izah gətirmişdir. Bütün bunlar “Quran elmləri”nin bəhs etdiyi “müşkilul-Quran”, “qəribul-Quran”, “mübhəmətul-Quran” və s. kimi elmlərin Hz. Peyğəmbərimizin (s.ə.s.) vaxtında ortaya çıxdığını göstərir.

## II. AYƏLƏR VƏ SURƏLƏR ARASINDAKI MÜNASİBƏT

“Münasibət” kəlməsi lüğətdə “yaxınlıq və oxşarlıq” mənalarına gəlir. Termin olaraq isə “bir-birinin ardınca gələn söz və cümlələr və ya arxa-arxaya anladılan hadisələr arasındakı əlaqə” deməkdir. “Münasəbatül-Quran” da ayə və surələr arasındakı məna baxımından əlaqəni ortaya çıxardan Quran elmidir.

Qurani-Kərim iyirmi üç il ərzində hissə-hissə endirilmişdir. Hər enən yeni ayə Cəbrail (əs) tərəfindən Hz. Peyğəmbərə (s.ə.s.) hansı surənin hansı ayəsindən sonra qoyulacağını diktə etmişdir. Bu vəziyyət, əlbəttə, təsadüfi deyil. Bu baxımdan məntiqcə hər bir ayə və surə arasında bir münasibət olduğu kimi, hər bir ayə və surənin də əvvəli və sonu arasında bir əlaqə vardır. Surələr arasındakı münasibətə “Fatihə” surəsi ilə “Bəqərə” surəsini misal vermək olar. “Fatihə” surəsində

İstənilən iki surənin əvvəli və sonu, həmçinin istənilən iki surə arasındakı əlaqəni öyrənib yoldaşlarınıza izah edin!

***“Bizi doğru yola yönəlt”*** deyən möminlərə cavab olaraq ondan sonra gələn “Bəqərə” surəsinin ilk ayələrində ***“İstədiyiniz doğru yol, özündə şübhə olmayan bu Qurandan başqası deyildir”*** buyurulmuşdur.

Surənin əvvəli ilə sonu arasındakı əlaqəyə misal olaraq da yenə “Bəqərə” surəsini vermək mümkündür. Belə ki, “Bəqərə” surəsinin başında Allah-Təala möminləri qeybə iman gətirən, namaz qılan, Uca Allahın onlara vediyi ruzidən infaq edən olaraq vəsfləndirmiş, axırında da həmin vəsfləri özündə əks etdirən möminlərin Hz. Muhammədin ümməti olduğunu qeyd etmişdir. Həmçinin surənin əvvəlində möminlərin vəsfindən olan qeybdən bəhs etmiş, sonunda da qeybdən məqsədin Allaha, mələklərə, kitablara, peyğəmbərlərə iman gətirmək olduğunu açıqlamışdır.

Bu sahədə öz töhfəsini verən alimlərin ilk sırasında Fəxrəddin ər-Razi (v. 606-1209) gəlir.

### III. ƏSBABI-NÜZUL

“Əsbabı-nüzul”un lüğəti mənası “nazil olma səbəbi”, termin mənası isə “bir və ya birdən çox ayənin enməsinə səbəb olan hadisələrdir”.

Qurani-Kərimin əksər ayələri sual və ya bir səbəb olmadan endirilmişdir. Bu ayələrin enmə səbəbi həmin ayələrin ifadə etdiyi mənalardır. Çox az hissəsi isə verilən suallar və ya baş verən hadisələrə cavab olaraq endirilmişdir.

Məsələn, bir gün Məkkə müşriklərindən As bin Vail Peyğəmbərimiz haqqında “nəsli kəsilmiş” sözünü işlətmişdir. Bunun müqabilində Allah-Təala:

إِنَّ شَانِئَكَ هُوَ الْأَبْتَرُ

Əsbabu nüzulu bilmənin faydasını bir misalla açıqlayın.

*“(Ya Peyğəmbər! Oğlun Qasım, yaxud İbrahim vəfat etdiyi zaman sənə sonsuz, arxası kəsik, nəsli kəsilmiş deyən)* ***sənin düşməninin*** *(As ibn Vailin)* ***özü sonsuzdur!*** *(Sənin nəslin qiyamətə qədər törəyib artacaq, adına isə həmişə rəhmət oxunacaqdır!)”* (Kovsər, 108/3) ayəsini nazil etdi.

Həmçinin bir gün Qüreyş kafirləri müsəlmanlara: “Nə biz, nə də siz təkrar dirildilməyəcəyik. Gəlin atalarınızın dininə geri dönün. Əgər bu bir günah olsa, günahı bizim olsun”, -dedilər. Bunun üzərinə aşağıdakı ayə nazil oldu:

وَقَالَ الَّذِينَ كَفَرُوا لِلَّذِينَ آمَنُوا اتَّبِعُوا سَبِيلَنَا وَلْنَحْمِلْ خَطَايَاكُمْ وَمَا هُمْ بِحَامِلِينَ مِنْ خَطَايَاهُمْ مِنْ شَيْءٍ إِنَّهُمْ لَكَاذِبُونَ

***“Kafir olanlar iman gətirənlərə dedilər: “Bizim yolumuza*** *(dinimizə)* ***tabe olun. Günahlarınızı öz boynumuza götürərik”. Halbuki onların*** *(iman gətirənlərin)* ***heç bir günahını öz boyunlarına götürməzlər. Onlar, həqiqətən, yalançıdırlar!”*** (Ənkəbut 29/12)

Aşağıdakı ayeyi-kərimənin enməsinə səbəb olan hadisə də belədir:

وَأَنْفِقُوا فِي سَبِيلِ اللّٰهِ وَلَا تُلْقُوا بِأَيْدِيكُمْ إِلَى التَّهْلُكَةِ وَأَحْسِنُوا إِنَّ اللّٰهَ يُحِبُّ الْمُحْسِنِينَ

*“(Malınızı)* ***Allah yolunda xərcləyin. Öz əlinizlə özünüzü təhlükəyə atmayın, yaxşılıq edin! Allah yaxşılıq*** *(ehsan)* ***edənləri sevir”.*** (Bəqərə 2/195)

Əməvilər dövründə Abdurrahman ibn Xalid ibn Vəlidin başçılıq etdiyi İslam ordusu, Hz. Peyğəmbərin (s.ə.s.) İstanbulun fəth olunmasıyla bağlı müjdəsinə nail olmaq ümidi ilə yola çıxmışdı. Ordunun içində yaşlı olmasına baxmayaq, Əbu Əyyub əl-Ənsari (r.ə.) də vardı.

Müharibənin qızğın bir vaxtında müsəlmanlardan bir nəfər atını düşmən ordusunun içinə qədər sürdü. Bunu görən möminlər yuxarıdakı ayəni fikirləşərək: “Lə ilahə illəllah! Buna bir baxın! Özünü göz görə-görə təhlükəyə atır!” -dedilər. Bunun müqabilində Əbu Əyyub əl-Ənsari həzrətləri belə dedi: “Ey möminlər! Bu ayə, biz Ənsar haqqında endirildi. Uca Allah Elçisinə yardım edib dininə qələbə qazandırdığında biz: “İşimizin başına keçib onunla məşğul olmağın vaxtı gəldi”, -demişdik. Bunun müqabilində Allah-Təala bu ayəni endirdi”.



Abəsə surəsinin 1-10-cu, Nur surəsi 11-16-cı, Hucurat surəsinin 1-3-cü ayələrinin eniş səbəblərini araraşdırın və yoldaşlarınızla müzakirə edin.

Göründüyü kimi hansısa ayənin endirilmə səbəbini bilməmək onun səhv izah edilməsi ilə nəticələndiyi kimi, nüzul səbəbini bilmək də ayənin doğru anlaşılmasına köməklik edir.

### IV. QƏRİBUL-QURAN

“اَلْغَرِيبُ / qərib” kəlməsinin lüğəti mənası “elindən obasından uzaq olan”, “qapalı olan”, “dostu olmayan”dır. Qərib ləfz “az istifadə olunduğuna görə lüğət olmadan anlaşılması çətin olan kəlmə” deməkdir. “Qəribul-Quran” elmi aşağıdakı kəlmə növlərini incələyən elmdir:

1. Qurani-Kərim Qüreyş ləhcəsində endirildiyi üçün onun xaricindəki ləhcələrdən alınmış sözlər və digər qeyri-ərəb millətlərdən alınıb ərəbcələşdirilmiş kəlmələr “Qəribul-Quran” elminə daxildir.

Bu məsələ, sadəcə, ərəb dilinə yox, bütün dillərə məxsusdur. Hər bir dil xarici dillərdən kəlmələr alaraq özününküləşdirmiş, beləliklə, öz kəlmə xəzinəsini genişləndirmişdir. Məsələn, dilimizə ərbəcədən keçmiş “kitab, məktəb, laqeyd, labüd” kimi sözlər bunlardandır.

Bunun kimi ərəbcəyə də başqa dillərdən kəlmələr keçmişdir. Bu kəlmələr olduğu kimi Quranda istifadə edilmişdir. Belə kəlmələrin çoxu insanlar tərəfindən gündəlik danışıqlarında istifadə olunmuşdur. Məsələn, fars mənşəli olan “senq kil”dən gələn “siccilin” sözü buna bir misaldır. Ancaq elə alınma sözlər də vardır ki, həmin kəlmələri bütün ərəblər bilmirdi. Məsələn, Abdullah bin Abbas “fatır” kəlməsini əvvəllər bilmədiyini, bu kəlmənin mənasını iki bədəvinin bir su quyusunun başında etdikləri mübahisədən öyrəndiyini bildirmişdir. Bunun üçün qərib kəlmələr haqqında araşdırmalar elə sahabələr dövründən başlamışdır. Bu kəlmələrin mənalarını öyrənmək üçün ərəb şeirindən də istifadə edilmişdir. Bu barədə Abdullah bin Abbas belə demişdir: “Şeir ərəbin divanıdır. Allah-Təalanın ərəbcə endirdiyi kəlmələrdən birini başa düşə bilməsək, ərəb divanına müraciət edərik”. Həqiqətən, şeir mövzusunda Abdullah bin Abbas dərin biliyə sahib olmuş və qərib kəlmələrin əksəriyyətinin mənasını ərəb şeirlərinə isnad edərək açıqlamışdır. Beləliklə, mənası başa düşülməyən kəlmələr olduğu zaman əksər vaxtlarda Abdullah bin Abbasa müraciət olunmuşdur.

Ancaq bu dövrdə islami elmlər tədvin olunmadığına görə qərib elmi ilə əlaqədar məlumatlar şifahi olaraq nəql olunurdu. Hicri ikinci yüz ildə digər islami elmlərlə bərabər “qəribul-Quran” elmi də yazılmağa başlandı. Beləliklə, Abdullah bin Abbas ilə başlayan qəribul-Quran ilə bağlı fəaliyyət Əbu Ubeyd əl-Qasım bin Səllam (ö.200/815), el-Fərra (ö.207/822), Əxfəş əl-Əvsat (ö.221/835), əz-Zəccac (ö.311/923) və Məmər bin əl-Müsənna (ö.210/825) ilə davam etdi.

2. Bəzi kəlmələr də vardır ki, ərəb mənşəli olmasına baxmayaraq çox nadir istifadə olunduğu üçün həmin kəlmə bir çox insan tərəfindən başa düşülməmişdir. Məsələn, “mərhəmət, ruh incəliyi və qəlb yumşaqlığı” mənasına gələn “حنانا / hanənən” sözü bunun bir nümunəsidir.

3. Qurani-Kərimdə elə qərib kəlmələr də vardır ki, bu kəlmələrin anlaşılmasını çətinləşdirən Quranın həmin sözlərə verdiyi yeni məna çalarlarıdır. Məsələn, “Bəqərə” surəsində keçən “ختم / xatəmə” sözünün “möhürlədi” mənasına gəldiyi bilindiyi halda “Allah onların qəlblərini möhürlədi” ifadəsinin mənasını bəziləri anlamamışlar. Həmçinin “kafir” sözünün mənası əvvəllər “cütcü” idiysə, daha sonra Qurani-Kərim bu kəlmənin mənasını “Allahı və ya digər iman əsaslarından hər hansı birini inkar edən” olaraq dəyişdirmişdir.

Nəticə etibarı ilə, qəribul-Quran elmi həm başqa dillərdən keçmiş kəlmələri, həm öz dilində olmasına baxmayaraq, az işləndiyi üçün mənası lüğətin köməkliyi ilə bilinən kəlmələri, həm də kəlmənin lüğət mənası bilinməklə yanaşı, ona yüklənmiş yeni mənalar səbəbi ilə anlaşılmayan kəlmələri tədqiq edən bir elmdir.

“Qəribul-Quran” haqqında yazılmış ən məşhur əsər Rağıb əl-İsfəhaninin “əl-Müfrədat fi qəribil-Quran” adlı kitabıdır.

Aşağıda Quranda mövcud olan qərib kəlmələrdən bəziləri qeyd edilmişdir:

| Kəlmə | Kəlmənin keçdiyi yer | Kəlmənin mənşəyi | Kəlmənin mənası |
|---|---|---|---|
| Səfih | Bəqərə, 2/13 | Kinanə ləhcəsi | Cahil |
| Saiqa | Bəqərə, 2/55 | Umman ləhcəsi | Ölüm |
| Bağy | Bəqərə, 2/90 | Təmim ləhcəsi | Həsəd |
| Yəmm | Araf, 7/136 | Qipt ləhcəsi | Dəniz |
| Əraiq | Yasin, 36/56 | Həbəşcə | Kreslolar |
| Əsbat | Bəqərə, 2/236 | İbranicə | Qəbilələr |
| Ğassəq | Nəbə, 78/25 | Türkcə | İylənmiş su, irin |
| Siccil | Fil, 104/4 | Farsca | Bişmiş palçıq |
| Əsfar | Cumə 62/5 | Süryanicə | Kitablar |

### V. HƏQİQƏT VƏ MƏCAZ

“Həqiqət” bir ləfzin qoyulduğu gerçək mənasında istifadə olunması, “məcaz” isə bir şeyin öz mənasından başqa bir məna ifadə etməsidir. Məsələn, “quzu” deyiləndə bildiyimiz quzudan söhbət getdiyini fikirləşirik. Amma biz həmin sözü “quzu kimi adam” deyərək sakit bir insanı tərif etdiyimizdə həmin sözü həqiqi mənada yox, məcaz olaraq istifadə etmiş oluruq.

Bu mənada Qurani-Kərimdə də məcazi mənada sözlərdən istifadə edilmişdir. Aşağıdakı ayəni buna misal olaraq vermək mümkündür.

كُلَّمَا أَوْقَدُوا نَارًا لِلْحَرْبِ أَطْفَأَهَا اللَّهُ وَيَسْعَوْنَ فِي الْأَرْضِ فَسَادًا وَاللَّهُ لَا يُحِبُّ الْمُفْسِدِينَ

***“...Onlar müharibə alovu yandırdıqca Allah onu söndürər. Onlar yer üzündə fitnə-fəsad törətməyə çalışarlar. Allah isə fitnə-fəsad törədənləri sevməz!”*** (Maidə, 5/64)

Bu ayədə qeyd edilən “alov” həqiqi mənada ocaq yandırmaq yox, “yer üzündə fitnə fəsad çıxartma” mənasında istifadə olunmuşdur. Burada fitnə-fəsad alova bənzədilmişdir. Ona görə ki, fitnə insanlar arasında düşmənçilik yaradaraq onların arasında müharibə çıxardıb bir-birlərini əridib yox etməsi baxımından alovla bənzərliyi vardır. Çünki alov bir şeyi yandıraraq əridib yox etdiyi kimi, fitnə də insanlar arasında nifaq salmaq surətilə onları məhv edir. Uca Allah fitnə-fəsadın

törətdiyi nəticələrə diqqət çəkmək üçün mücərrəd olan nifaq hadisəsini müşəxxəsləşdirərək insanların diqqətlərini cəlb etmişdir.

Məcaz sözün həm ədəbi dəyərini, həm də gücünü artırır. Bunun üçün filoloqlar məcazın həqiqətdən daha təsirli olduğunu söyləmişlər. Buna görə Qurani-Kərimdə məcazdan istifadə olunması onun həm təsirliliyini, həm bəlağətliliyini, həm də şirinliyini artırmışdır.

Məcazla əlaqədar yazılmış əsərlər arasında bunları qeyd edə bilərik:

1. Əbu Übeydə Məmər bin əl-Müsənna (ö.210/825), “Məcazul-Quran”.

2. əş-Şərif ər-Radi (ö.406/1015), “Təlxisul-Bəyan fi məcazil-Quran”.



“İnsanların dalğa-dalğa Allahın dininə girdiklərini...” Nəsr surəsi 1-ci, “Əbu Ləhəbin iki əli qurusun...” Təbbət surəsi 1-ci, “Əlbətdə, yer üzündə yeriyən canlılardan Allah qatında ən pisi, ağıllarından istifadə etməyən, kar, dilsizlərdir.” Ənfal surəsi 22-ci , Bəqərə surəsi 16-cı ayələrinin həqiqət və məacaz baxımından yoldaşlarınızla müzakirə edin.

**VI. HÜRUFÜ-MÜQƏTTƏƏ**

“اَلْحُرُوفُ الْمُقَطَّعَةُ / hürufü-müqəttəə” kəlmə olaraq “kəsik hərflər”, termin olaraq isə “Qurani-Kərimdəki bəzi surələrin başında olub bir hərf və ya bir neçə hərf birləşməsindən əmələ gələn hərflərə” verilən addır.

Qurani-Kərimdə iyirmi doqquz surə bu hərflərlə başlayır. Bu hərflərin mənaları haqqında bir çox fikirlər irəli sürülmüşdür. Mənası açıq olmadığına görə bunlara Quranın mütəşabehləri də demək mümkündür.

Bu hərflərdən bəziləri bunlardır:

الم : “Bəqərə”, “Ali İmran”, və “Ənkəbut”,

المص : “Rum”, “Loğman”, “Səcdə”

كهيعص : “Məryəm”

Hürufü-müqəttəənin nə mənaya gəldiyi haqqında alimlər ixtilaf etmişlər. Bu müxtəlif fikirləri aşağıda üç maddədə açıqlamaq olar.

1. Birinci görüş sələfin görüşüdür ki, onlara görə, həmin sözlərin mənası insanlardan gizlənmişdir. Onların bu fikirlərini dəstəkləyən sözlərdən biri Hz. Əbu Bəkrin (r.ə.) bu sözüdür: “Hər kitabın bir sirri var. Uca Allahın kitabındakı sirr də surə başlarında yer alan hərflərdir”. Həmçinin bu haqda ər-Razi belə demişdir: “Necə ki bir tarla sulandığı zaman tarlanın ehtiyacı qədər su verilirsə, Allah yanında olan bilgilərdən də rəsullərinə lazımi qədər verilmişdir. Bunun üçün rəsullər alimlərə, alimlər də insanlara onların qaldıra biləcəkləri qədər elm öyrətmişlər. Alimlər, peyğəmbərlər və mələklər üçün sirlər vardır. Hər qrup ona veriləndən artığına tab gətirə bilməz. Çünki ağıl tam və mükəmməl deyildir. Göz, günəş işığına dözə bilmədiyi kimi ağıl da sirlərə tab gətirə bilməz”.

İbn Teymiyyə və Almalılı Həmdi Yazır kimi alimlər də yuxarıdakı fikirləri mənimsəmişlər.

Nəticə olaraq sələf alimləri müqəttəə hərflərini Quranın sirləri olaraq qəbul etmişlər. Onlara görə bu hərflərin, əlbəttə, bir mənası vardır, bu mənanı ancaq Hz. Peyğəmbər (s.ə.s.) bilmişdir.



**BUNU BİLİRDİNİZMİ?**

Hürufü-müqəttəə hərflərinin sayı 14 ədəddir.

Bu da ərəb hərflərinin yarısı qədərdir.

Bu hərflər “نص حكيم قاطع له سر” cümləsində toplanmışdır.

2. İkinci görüş də daha sonrakı dövrlərdə yaşamış əhli-sünnə kəlamçıları dediyimiz xələfin görüşüdür. Onların fikirlərinə görə, Quranda hər hansı bir şeyin başa düşülməməsi mümkün deyildir. Ona görə bu hərflərin mənalarını elmi dərin olan adamlar bilir.

Hürüfu-müqəttəənin mənalarını başa düşməyin mümkün olduğunu deyən alimlər bu səfər həmin mənalar haqqında müxtəlif fikirlər irəli sürmüşlər. Bu mənaları dörd qrupda ifadə etmək mümkündür:

a) Bu hərflərdə Uca Allahın isim və sifətləri gizlənmişdir. Məsələn, الم hərflərin Allah, Lətif, Məcid olaraq açıqlanmışdır. Həmçinin bəzi kəlamçılara görə, müqəttəə hərfləri Allah-Təalanın həmin hərflə başlayan bütün isim və sifətlərinə dəlalət edir. Məsələn, الم daki “əlif” hərfi Allahın Əhəd, Əvvəl, Axir, Əzəli və Əbədi , “lam” hərfi Lətif, “mim” hərfi də Məlik, Məcid və Mənnad adlarına işarə edir.

Bu mövzuda İbn Abbasdan gələn başqa bir rəvayət də belədir: الم dən məqsəd “Mən Allaham, hər şeyi bilirəm” deməkdir.

b) Başqa bir görüşə görə də həmin hərflər olduqları surələrin adlarıdır. Bu görüş zəif bir görüşdür. Çünki bəzi müqəttəə hərfləri bir neçə surə başlarında qeyd olunur. Əgər bu hərflərin həmin surələrin adlarına dəlalət etdiyini fikirləşsək, o zaman bir neçə surənin adı eyni olmalıdır. Bu da düzgün olmaz.

Digər bir görüşə görə də Uca Allah zamana, xurmaya yemin etdiyi kimi yemin etmişdir. Bu görüşdə də zəiflik vardır. Çünki bu hərflərdən sonra yeminlə başlayan ayələr gəlir ki, bu da xoş görünməmişdir. Çünki bir şey üçün iki dəfə arxa-arxaya yemin etmək düzgün deyildir.

c) Sonuncu görüşə görə isə bu hərflərdən məqsəd insanların diqqətini cəlb etməkdir. Bu görüşü mənimsəyənlər fikirlərini belə izah edirlər, Qurani-Kərimin o qədər ecazkar üslubları vardır ki, onu müşriklər belə heyranlıqla dinləmişlər. Bu səbəbdən Məkkəli müşriklər Quranın təsiri altına düşməmək üçün Quran oxunanda gurultu çıxartmağı qərarlaşdırmışlar. Ancaq Hürufü-muqəttəə ilə başlayan surələr endiriləndə Qurani-Kərimə təkrar qulaq asmaq məcburiyyətində qalmışlar. Çünki bu şəkildəki sözlər onlara qeyri-adi gəlmiş və bundakı mənanı istər istəməz fikirləşməyə başlamışlar.

Allah-Təala sanki müşriklərə bu ayələrlə belə meydan oxumuşdur: “Bu Quran sizin bildiyiniz əlif, lam, mim kimi hərflərdən ibarətdir. Sizin bilmədiyiniz hərflərdən və ya sözlərdən ibarət deyildir. Gücünüz çatırsa sizin dilinizdə endirdiyim bu Quranın bir bənzərini gətirin”. Əlbəttə ki, öz söz sənəti ilə öyünən müşrik ərəblər bu meydan oxumanın qarşısında aciz qalmışdılar.

## VII. MÖHKƏM VƏ MÜTƏŞABEH

Qurani-Kərim bir qismi möhkəm, bir qismi də mütəşabeh ayələrdən ibarətdir. Möhkəm ayələr, anlaşılmasında çətinlik çəkilməyən açıq ifadələrdir. Mütəşabeh ayələr isə əksinə mənası asanlıqla

Aşağıdakı ikilidə olduğu kimi digərlərini Quranı Kərimdən taparaq yazın

| 1-li | 2-li | 3-lü | 4-lü | 5-li |
|---|---|---|---|---|
| ...... | حم | ............. | ............... | ....................... |

bilinməyən ayələrdir. Qurani-Kərimin möhkəm və mütəşabeh ayələrdən ibarət olduğunu Allah-Təala aşağıdakı ayədə belə bildirir:

هُوَ الَّذِي أَنْزَلَ عَلَيْكَ الْكِتَابَ مِنْهُ آيَاتٌ مُحْكَمَاتٌ هُنَّ أُمُّ الْكِتَابِ وَأُخَرُ مُتَشَابِهَاتٌ فَأَمَّا الَّذِينَ فِي قُلُوبِهِمْ زَيْغٌ فَيَتَّبِعُونَ مَا تَشَابَهَ مِنْهُ ابْتِغَاءَ الْفِتْنَةِ وَابْتِغَاءَ تَأْوِيلِهِ وَمَا يَعْلَمُ تَأْوِيلَهُ إِلَّا اللَّهُ وَالرَّاسِخُونَ فِي الْعِلْمِ يَقُولُونَ آمَنَّا بِهِ كُلٌّ مِنْ عِنْدِ رَبِّنَا وَمَا يَذَّكَّرُ إِلَّا أُولُو الْأَلْبَابِ

**“***(Ya Rəsulum!)* **Sənə Kitabı** *(Quranı)* **nazil edən Odur. Onun** *(Kitabın)* **bir hissəsi** *(Quranın əslini, əsasını təşkil edən)* **möhkəm** *(mənası aydın, hökmü bəlli)***, digər qismi isə mütəşabeh** *(çətin anlaşılan, dəqiq mənası bilinməyən, məğzi bəlli olmayan)* **ayələrdir. Ürəklərində əyrilik** *(şəkk-şübhə)* **olanlar fitnə-fəsad salmaq və istədikləri kimi məna vermək məqsədilə mütəşabeh ayələrə uyarlar** *(tabe olarlar)***. Halbuki onların yorumunu** *(həqiqi mənasını)* **Allahdan** *(yaxud Allahdan və elmdə qüvvətli olanlardan)* **başqa heç kəs bilməz. Elmdə qüvvətli olanlar isə: “Biz onlara iman gətirdik, onların hamısı Rəbbimizin dərgahındandır”, - deyərlər. Bunları ancaq ağıllı adamlar dərk edərlər”.** (Ali-İmran 3/7)

“اَلْمُحْكَمُ / möhkəm” kəlməsi lüğətdə “pozulmayan, həqiqi və sağlam”, termin olaraq isə “mənası aydın, hökmü bəlli ” olan deməkdir.

Qurani-Kərimdə Allahın birliyini bildirirən, yaxşılığı və ədalətli olmağı əmr edən, eyni zamanda şirk qoşmağı, qumar oynamağı, donuz əti yeməyi, zina etməyi, içki içməyi, yetim malı yeməyi və s. qadağan edən bütün ayələr hökmü açıq olan möhkəm ayələrdir. Belə ayələr elm sahibləri tərəfindən rahatlıqla anlaşıla bilən, şübhə əmələ gətirməyən hökmlərdir. Bu kimi ayələr Quranın əsasını təşkil edir və qiyamətə qədər də dəyişilmədən davam edən hökm və əxlaq normalardır.

“التَشابُهُ / təşabuh” kəlməsinin lüğətdəki mənası “iki şeyin bir-birinə bənzəməsi” anlamındadır. Termin olaraq da “məğzi bəlli olmayan ayələr” olaraq tərif etmək mümkündür. Mütəşabeh ayələr bir-birinə bənzər mənalar ifadə etməsi və ya anlaşılmasında qapalılıq olması səbəbi ilə mənası dəqiq bilinir. Qurani-Kərimin əksər hissəsi belə ayələrdən ibarətdir.

Əş-Şatibi (ö.790/138) mütəşabeh ayələri “mütləq və izafi” olaraq iki qismə ayırır. Onun fikrincə, mütləq mütəşabehlərin mənasını ancaq Allah-Təala bilir, izafi mütəşabehləri isə dərin elmə sahib olan alimlər bilir.

### A. Mütləq mütəşabehlər

Belə mütəşabehlər insan oğlunun başa düşə bilmədiyi ifadələrdir. Bunların mənasını, mahiyyətini yalnız Allah-Təala bilir. Bunlar qiyamətin nə vaxt qopacağı, dabbətül-ərzin çıxışı, Hz. İsanın atasız dünyaya gəlməsi, Üzeyrin (əs) yüz il ölü qaldıqdan sonra dirildilməsi, İbrahimin (əs) istəyi nəticəsində Allahın onun gözləri önündə ölü quşları diriltməsi, əshabi-Kəhfin üç yüz doqquz il mağarada qalıb təkrar oyandırılmaları kimi mövzuları əhatə edən mütəşabehlərdir. Həmçinin Allahın əli və üzünün olduğunu, ərşin üzərinə oturduğunu bildirən ayələr də bu qrupa daxil olan ayələrdir.

Yuxarıdakı mövzulardan bəhs edən ayələrin həqiqi anlamını qavramaq insan oğlu üçün mümkün deyildir.

**B. İzafi mütəşabehlər**

Bu qisim mütəşabehlərin mənası elm sahibləri tərəfindən açıqlansa da, həmin ayələrin mənasında həmfikir olmamışlar. Bu ayələrin anlaşılmasında çətinlik törədən məqamları belə açıqlamaq mümkündür:

√ Bu ayələrdə müşkül, mücməl, mübhəm, qərib kimi ləfizlərin olması,

√ İnsanlar tərəfindən kəşf olunmamış, bu haqda hər hansı bir məlumat olmayan kainatla bağlı həqiqətlərdən bəhs etməsi

İzafi mütəşabehlərin həqiqi mütəşabehlərə görə anlaşılması daha asandır. Belə ayələri anlamaqda çətinlik törədən səbəblərdən biri ləfzlərlə bağlıdır. Buna "Əbəsə" surəsinin 31-ci ayəsində qeyd olunan "وَفَاكِهَةً وَأَبًّا" dəki "əbbən" kəlməsini misal göstərmək olar. Buradakı "əbbən" kəlməsi mübhəm bir kəlmədir. Bu ayə haqqında Hz. Əbu Bəkrdən soruşduqda belə cavab vermişdir: "Allahın kitabı haqqında bilmədiyim bir şeyi söyləsəm, hansı səma məni kölgələndirər, hansı yer məni üstündə tutar?" Hz. Əbu Bəkr bu sözü ilə "əbbən" kəlməsinin mənasını bilmədiyini etiraf etmişdir.

Həmçinin "Məryəm" surəsinin 17-ci ayəsində belə buyurulur:

فَاتَّخَذَتْ مِنْ دُونِهِمْ حِجَابًا فَأَرْسَلْنَا إِلَيْهَا رُوحَنَا فَتَمَثَّلَ لَهَا بَشَرًا سَوِيًّا

***"Və ailə üzvlərindən gizlənmək** (paltarını dəyişmək, yaxud yuyunub təmizlənmək) **üçün pərdə tutmuşdu. Biz də Öz ruhumuzu** (Cəbraili Məryəmin) **yanına göndərdik. Ona** (Məryəmə) **kamil bir insan qiyafəsində göründü."*** (Məryəm 19/17)

Burada "Öz ruhumuz"dan nə qəsd olunduğu tam bilinmir. Bunun Allahın elçisi Cəbrail olduğunu həmin surənin 19-cu ayəsindən belə öyrənirik:

قَالَ إِنَّمَا أَنَا رَسُولُ رَبِّكِ لِأَهَبَ لَكِ غُلَامًا زَكِيًّا

***"**(Cəbrail:) **"Mən sənə ancaq təmiz** (məsum) **bir oğlan bağışlamaq üçün Rəbbinin** (göndərdiyi) **elçisiyəm!" – dedi."*** (Məryəm 19/19)

Bəzən ayənin başa düşülməsinə əngəl olan həmin ayənin mənası ola bilir. Bu kimi ayələr əksəriyyətlə insan oğlunun məlumat sahibi olmadığı mövzuları əhatə edən ayələrdir. Belə ayələrin anlaşılması elmin inkişafına paralel olaraq asanlaşmışdır. Bu haqda aşağıda verilən misallar məsələyə aydınlıq gətirmə baxımından önəmlidir.

Məsələn, aşağıdakı ayədə Allah-Təala belə buyurur: ***"Bəli, Biz onun barmaqlarını da** (barmaq sümüklərini də, barmaqlarının uclarını da) **düzəltməyə qadirik!"*** ayədə qeyd edilən "barmaqların uclarını da" ifadəsi, insanların barmaq uclarındakı xətlərin bir-birinə bənzəmədiyi kəşf olunduqdan sonra daha yaxşı anlaşılmışdır. Burada Allah-Təala milyardlarla insanı təkrar dirildəcəyi vaxt onların ən incə detallarına qədər eyni olaraq dirildəcəyinə diqqət çəkərək öz qüdrətinin böyüklüyündən söhbət açmışdır. Biz bu ifadənin nə qədər böyük bir məna daşıdığını ancaq elmin inkişafına bağlı olaraq başa düşürük.

Həmçinin aşağıdakı ayədə duzlu su ilə şirin suyun bir-birinə qarışmadığı buyurulur.

وَهُوَ الَّذِي مَرَجَ الْبَحْرَيْنِ هَٰذَا عَذْبٌ فُرَاتٌ وَهَٰذَا مِلْحٌ أُجَاجٌ وَجَعَلَ بَيْنَهُمَا بَرْزَخًا وَحِجْرًا مَحْجُورًا

1. ***"Birinin suyu çox şirin, digərininki isə olduqca duzlu olan iki dənizi qovuşduran, aralarında** (bir-birinə qarışmamaq üçün) **maneə və keçilməz sədd qoyan Odur!"*** (Furqan 25/53)

Burada iki suyun bir-birinə qarışmasına əngəl olan pərdədən nə demək istənildiyi tam bilinmədiyinə görə həmin ayə də mütəşabeh ayələrdən sayılır. Bu haqda müfəssirlərin bir qismi həmin pərdənin "qara parçası" olduğunu söylərkən, bir qisim müfəssirlər də bunun "Allahın qüdrəti ilə yaratdığı bir sədd" olaraq açıqlamışlar. Ancaq son elmi araşdırmalar bu iki suyun bir-birinə qarışmamasına səbəb olan pərdənin iki dəniz arasında mövcud olan "su əngəli" olduğunu ortaya qoymuşdur.



Ənam, 6/125, Hicr 15/22, Zariyat 51/47-ci ayələrinin mütəşabehlik yönünü araşdırın.

**C. Mütəşabeh ayələrin Quranda yer almasının hikmətləri**

⏩ Bu kimi mütəşabehlər insan üçün bir imtahan vasitəsidir. Çünki bu ayələr insanın qeybə olan imanının dərəcəsini ölçər.

⏩ Bu ayələr insana elmindən və qabiliyyətindən asılı olmayaraq, acizliyini və cahil olduğunu bildirərək Allah-Təalanın qüdrətini və elminin ucalığını dərk etdirir.

⏩ Mütəşabeh ayələr Quranın əzbərlənməsini asanlaşdırır.

⏩ Mütəşabeh ayələr səbəbi ilə insan əqli dəlillərə müraciət etmiş, zehni fəaliyyətini fəal tutmuşdur.

⏩ Mütəşabeh ayələr sayəsində insanların elmi araştırmaları davam etmişdir. Quranın hamısı möhkəm ayələrdən ibarət olsaydı insanların zehni fəaliyyəti, təfəkkürü dondurulmuş olardı. Bu ayələr səbəbi ilə alimlər zamana, məkana görə, şərtlərə uyğun yeni yozumlar gətirmişlər. Beləliklə, İslam dini öz aktuallığını və ümumbəşəriliyini daim qorumuşdur.

**VIII. MÜBHƏM**

"مُبهَم / Mübhəm" sözünün lüğəti mənası "qapalı", "anlaşılmaz"dır. Termin olaraq isə, Quranda yer, zaman, şəxs kimi adların açıq olaraq bildirilməməsi mənalarını daşıyır. Bu kimi sözlərin mənasını doğru anlamaq üçün əvvəlcə Qurana, sonra sünnəyə, daha sonra da səhabənin görüşlərinə yer verilməlidir. Aşağıdakı misallar bu mövzunu daha yaxşı anlamamıza imkan verəcəkdir:

وَالَّتِي أَحْصَنَتْ فَرْجَهَا فَنَفَخْنَا فِيهَا مِنْ رُوحِنَا وَجَعَلْنَاهَا وَابْنَهَا آيَةً لِلْعَالَمِينَ

***"**(Ya Rəsulum!)* ***İsmətini** (bəkarətini)* ***qoruyanı da** (Məryəmi də yad et)**! Biz Öz ruhumuzdan** (Özümüzün yaratdığımız ruhdan Cəbrail vasitəsilə)* ***ona üfürdük, onu və oğlunu** (atasız doğulmuş İsanı)* ***aləmlərə** (mələklərə, bütün insanlara və cinlərə)* ***bir möcüzə etdik".*** (Ənbiya 21/91)

Yuxarıdakı ayeyi-kərimədə namusunu qoruyan bir xanımdan söhbət gedir. Həmin xanımın Məryəm olduğunu biz aşağıdakı ayədən öyrənirik:

وَمَرْيَمَ ابْنَتَ عِمْرَانَ الَّتِي أَحْصَنَتْ فَرْجَهَا فَنَفَخْنَا فِيهِ مِنْ رُوحِنَا وَصَدَّقَتْ بِكَلِمَاتِ رَبِّهَا وَكُتُبِهِ وَكَانَتْ مِنَ الْقَانِتِينَ

***"**(Allah mömin qadınlara)* ***həmçinin namusunu** (ismətini)* ***möhkəm qoruyub saxlamış İmranın qızı Məryəmi də misal çəkdi. Biz** (Cəbrail vasitəsilə)* ***libasının yaxasından ona Öz ruhumuzdan** (Öz yaratdığımız ruhdan)* ***üfürdük. Məryəm Rəbbinin sözlərini** (şəriətini, dini hökmlərini)**, kitablarını təsdiq etdi və** (Allaha)* ***itaət edənlərdən oldu".*** (Təhrim 66/12)

وَيَقُولُ الَّذِينَ آمَنُوا أَهَؤُلَاءِ الَّذِينَ أَقْسَمُوا بِاللَّهِ جَهْدَ أَيْمَانِهِمْ إِنَّهُمْ لَمَعَكُمْ حَبِطَتْ أَعْمَالُهُمْ فَأَصْبَحُوا خَاسِرِينَ

***“İman gətirənlər isə deyəcəklər: “Sizinlə birlikdə olacaqları barədə Allaha** (yalandan) **möhkəm andlar içən kəslər bunlarmıdır?” Onların** (bütün) **əməlləri puça çıxdı və** (axirətdə) **zərərçəkənlərdən oldular”.*** (Maidə 5/53)

Ayədə and içən kimsələrin kimlər olduğu mübhəmdir. Bu qapalılığı aşağıdakı ayeyi-kərimə açıqlayır:

لَوْ كَانَ عَرَضًا قَرِيبًا وَسَفَرًا قَاصِدًا لَاتَّبَعُوكَ وَلَٰكِنْ بَعُدَتْ عَلَيْهِمُ الشُّقَّةُ وَسَيَحْلِفُونَ بِاللَّهِ لَوِ اسْتَطَعْنَا لَخَرَجْنَا مَعَكُمْ يُهْلِكُونَ أَنْفُسَهُمْ وَاللَّهُ يَعْلَمُ إِنَّهُمْ لَكَاذِبُونَ

***“Əgər o** (dəvət olunduqları yürüş)**, asan əldə edilən mənfəət** (dünya malı, yaxud qənimət) **və orta** (mənzilli) **bir səfər olsaydı, onlar mütləq sənin ardınca gedərdilər. Lakin yorucu** (məşəqqətli) **məsafə** (Təbuk səfəri) **onlara uzaq gəldi. Bununla belə, onlar: “Əgər gücümüz çatsaydı, biz də sizinlə bərabər səfərə çıxardıq”, - deyə Allaha and içəcəklər. Onlar** (yalandan Allaha and içməklə) **özlərini həlak edirlər. Allah isə onların yalançı olduqlarını bilir”.*** (Tövbə 9/42)

Ayələrdəki qapalılığı Hz. Peyğəmbər də izah etmişdir. Məsələn, “Yunis” surəsinin 26-cı ayəsində qeyd edilən “لِلَّذِينَ أَحْسَنُوا الْحُسْنَىٰ وَزِيَادَةٌ ***Yaxşı işlər görənləri Cənnət və daha artıq** (ziyadə) **mükafat gözləyir.”***

Bu ayədəki “ziyadə /artıq” kəlməsinin mənasını Peyğəmbərimiz belə açıqlamışdır: *“Allah mühsin qullarını cənnətlə mükafatlandırdıqdan sonra, onlara Öz camalını da göstərəcəkdir.”* (Suat Yıldırım, Peygamberimizin Kuran tefsiri, s. 184.)

**IX. MÜCMƏL VƏ MÜBƏYYƏN**

“اَلْمُجْمَلُ / mücməl” sözünün lüğətdə “bir araya gətirilmiş, qısa ifadə edilmiş”, termin olaraq da “nə qəsd olunduğu anlaşılmayan dərəcədə qapalı olan, ancaq Uca Allah və Rəsulunun (s.ə.s.) açıqlamasıyla başa düşülən ayə” mənasına gəlir.

“الْمُبَيَّنُ / mübəyyən” kəlməsinin lüğətdəki mənası “açıqlanmış, bəyan olmuş”dur. Termin olaraq isə “Quranda mücməl olan ayələrin açıqlanması” deməkdir. Mübəyyən ləfzlərin ifadə etdiyi məna, şübhəyə yer olmayan dərəcədə açıq və dəqiqdir. Məsələn, “zəkat verin” ifadəsindən, zəkatın verilməsinin lazım olduğu başa düşülür. Zəkatı kimlərin və nə qədər verəcəyini də sünnə açıqlamışdır.

Ayədəki qapalılığa gəldikdə isə onun bu qapalılığı bəzən çox istifadə olunmamasından irəli gəlir. “Məaric” surəsinin 19-21-ci ayələrini buna misal vermək olar. “إِنَّ الْإِنْسَانَ خُلِقَ هَلُوعًا / ***insan “həluən” olaraq yaradılmışdır”*** ayəsindəki “هَلُوعًا / həluən” sözü mücməl bir ləfzdir. Bu sözün mənasının “həris” və “səbirsiz” anlamına gəldiyini biz həmin ayədən sonra gələn ayələrlə başa düşürük. Ayələrdə belə buyurulur: “إِذَا مَسَّهُ الشَّرُّ جَزُوعًا / ***Ona bir pislik üz verdikdə fəryad qoparar.”*** “وَإِذَا مَسَّهُ الْخَيْرُ مَنُوعًا / ***Ona bir xeyir nəsib olduqda isə xəsis olar.”*** (Məaric 70/21)

مِنْهَا خَلَقْنَاكُمْ وَفِيهَا نُعِيدُكُمْ وَمِنْهَا نُخْرِجُكُمْ تَارَةً أُخْرَىٰ ***“Sizi** (ulu babanız Adəmi) **də onda** (o torpaqdan) **yaratdıq. Sizi** (öləndən sonra) **ora qaytaracaq və** (qiyamət günü) **bir daha oradan** (dirildib) **çıxardacağıq.”*** (Ta ha 20/55) ayəsində keçən هَا əvəzliyi ilə anladılan mübhəmlərin anlamını, Mömin surəsinin 67-ci və Rum surəsinin 25-ci ayələrin köməyi ilə tapın.

**AÇIQLAYAQ**

Quranda təmizlənmək anlamına gələn “zəkat” mücməlini, necə mübəyyən hala gəldiyini sinifdə yoldaşlarınızla birlikdə müzakərə edərək açıqlayın!

Bəzən də ayənin mücməl olmasının səbəbi təşbeh olmaqdadır. Məsələn, “وَكُلُوا وَاشْرَبُوا حَتَّىٰ يَتَبَيَّنَ لَكُمُ الْخَيْطُ الْأَبْيَضُ مِنَ الْخَيْطِ الْأَسْوَدِ / ***ağ sap qara sapdan fərqlənincəyə qədər yeyib için”*** (Bəqərə, 2/187) ayəsi mücməldir. Ayənin arxasından gələn “مِنَ الْفَجْرِ / ***sübh”*** sözü bu mücməlliyi açıqlayır. Yəni ağ sapla qara sapdan məqsədin sübhün açılması olduğu aydın olur.

Ləfzin lüğəti mənası bilinməklə birlikdə ona yüklənən yeni məna da onu mücməlləşdirməkdədir. Məsələn, “وَأَقِيمُوا الصَّلَاةَ وَآتُوا الزَّكَاةَ وَارْكَعُوا مَعَ الرَّاكِعِينَ / *(Müsəlmanların namazı kimi)* ***namaz qılın, zəkat verin və rüku edənlərlə birlikdə rüku edin!”*** (Bəqərə, 2/43) ayəsindəki “səlat” sözünün mənası lüğətdə “dua” anlamına gəldiyi halda, Allah-Təala onu “rükunları olan namaz ibadəti” anlamında istifadə etmişdir. Bütün bunların hamısını Hz. Peyğəmbər həyatda tətbiq edərək açıqlamış və beləcə, bu ləfzlər mübəyyən hala gəlmişdir.

**X. MÜŞKİLÜL-QURAN**

“اَلْمُشْكِلُ / müşkül” lüğətdə “qarışıq, bir-birinə zidd olan şey” mənalarına gəlir. Termin olaraq isə “Qurani-Kərimin bəzi ayələri arasında ziddiyyət kimi görünən məsələlər” kimi tərif olunur. Əslində Qurani-Kərimdə ayələr arasında bir ziddiyyət ola bilməz. Çünki Allah-Təala Qurani-Kərimdə özü bunu bizə bildirir. Ayeyi-kərimədə belə buyurulur:

أَفَلَا يَتَدَبَّرُونَ الْقُرْآنَ وَلَوْ كَانَ مِنْ عِنْدِ غَيْرِ اللّٰهِ لَوَجَدُوا فِيهِ اخْتِلَافًا كَثِيرًا

***“Onlar Quran barəsində*** *(onun Allah kəlamı olması haqqında)* ***düşünməzlərmi? Əgər o, Allahdan qeyrisi tərəfindən olsaydı, əlbəttə, onda çoxlu ziddiyyət*** *(ixtilaf, uyğunsuzluq)* ***tapardılar.”*** (Nisa 4/82)

Yuxarıdakı ayədə buyrulduğu kimi Qurani-Kərimdə bir-birinə zidd olan ayələr yoxdur. Ancaq Qurani-Kərimdə elə ayələr vardır ki, həmin ayələr zahirən Quran haqqında dərin biliyə sahib olmayan insanlar tərəfindən bir-birinin ziddi kimi görünür. “Müşkilül-Quran” elmi məhz həmin ayələr haqqında izahlar gətirərək insanların ağlına gələn şübhələri aradan qaldırır. Məsələn aşağıdakı ayələri buna misal vermək olar:

“خَلَقَهُ مِنْ تُرَابٍ / ***Allah onu torpaqdan yaratdı”*** (Ali İmran, 3/59)

“وَلَقَدْ خَلَقْنَا الْإِنْسَانَ مِنْ صَلْصَالٍ مِنْ حَمَإٍ مَسْنُونٍ / ***Biz insanı quru*** *(toxunduqda saxsı kimi səs çıxaran)* ***və qoxumuş*** *(və ya torpaqdan tədriclə dəyişib başqa şəklə düşmüş)* ***qara palçıqdan yaratdıq!”*** (Hicr, 15/26)

“وَإِذْ قَالَ رَبُّكَ لِلْمَلَائِكَةِ إِنِّي خَالِقٌ بَشَرًا مِنْ صَلْصَالٍ مِنْ حَمَإٍ مَسْنُونٍ / *(Ya Rəsulum!)* ***Xatırla ki, bir zaman Rəbbin mələklərə belə demişdi: “Mən quru və qoxumuş*** *(dəyişib başqa şəklə düşmüş)* ***qara palçıqdan insan yaradacağam!”*** (Hicr, 15/28)

“إِنَّا خَلَقْنَاهُمْ مِنْ طِينٍ / ***Biz onları*** *(insanların babası Adəmi)* ***yapışqan*** *(kimi)* ***bir palçıqdan yaratdıq.”*** (Saffat, 37/11)

Bütün bu ayələr insanın yaradılışından bəhs edir. Ancaq ilk baxışda yuxarıdakı ayələrin hamısı bir-birinə zidd kimi görünür. Ona görə ki, insanın gah torpaqdan, gah quru qoxumuş palçıqdan, gah yapışqan palçıqdan yaradıldığı buyurulur. Bu vəziyyət insanlarda şübhə əmələ gətirə bilər. Halbuki yuxarıdakı hər bir ayədə insanın nəticə etibarilə torpaqdan yaradıldığından bəhs olunur. Sadəcə olaraq torpaq sözünün fərqli ifadələrlə qeyd olunması insanın yaradılış mərhələlərini

“*(Ya rəsulum!)* ***Bu peyğəmbərlərin bəzisini digərindən üstün etdik...”*** (Bəqərə, 2/253)

***“ Biz onun peyğəmbərləri arasında fərq qoymuruq”*** (Bəqərə, 2/285)

Yuxarıdakı ayələr arasındakı münasəbəti dəyərləndirin!

anlatmasından irəli gəlir. Beləliklə, yuxarıdakı ayələr arasında hər hansı bir ziddiyyət olmadığı ortaya çıxır.

Başqa bir ayeyi-kərimədə Allah-Təala belə buyurur:

وَإِنْ خِفْتُمْ أَلَّا تُقْسِطُوا فِي الْيَتَامَىٰ فَانْكِحُوا مَا طَابَ لَكُمْ مِنَ النِّسَاءِ مَثْنَىٰ وَثُلَاثَ وَرُبَاعَ فَإِنْ خِفْتُمْ أَلَّا تَعْدِلُوا فَوَاحِدَةً أَوْ مَا مَلَكَتْ أَيْمَانُكُمْ ذَٰلِكَ أَدْنَىٰ أَلَّا تَعُولُوا

***“Əgər yetim qızlarla*** *(evlənəcəyiniz təqdirdə)* ***ədalətlə rəftar edə bilməyəcəyinizdən qorxarsınızsa, o zaman sizə halal olan*** *(bəyəndiyiniz)* ***başqa qadınlardan iki, üç və dörd nəfərlə nikah bağlayın! Əgər*** *(onlarla da)* ***ədalətlə dolanmağa əmin deyilsinizsə, o halda təkcə bir nəfər*** *(azad)* ***qadın və ya sahib olduğunuz kənizlə evlənin*** *(yaxud: o halda təkcə bir nəfər azad qadınla evlənin və ya əlinizin altında olan kənizlərlə kifayətlənin)****. Bu, ədalətli olmağa*** *(ədalətdən kənara çıxmamağa)* ***daha yaxındır”.*** (Nisa 4/3)

Bu ayədə Allah-Təala bir, iki, üç, hətta dörd qadınla evlənməyə icazə vermişdir. Ancaq bunu ədalətli olma şərtinə bağlamışdır.

Bu ayə ilə təzad kimi görünən aşağıdakı ayədə də Allah-Təala belə buyurur:

“وَلَنْ تَسْتَطِيعُوا أَنْ تَعْدِلُوا بَيْنَ النِّسَاءِ وَلَوْ حَرَصْتُمْ / ***Siz nə qədər çox istəsəniz də, heç vaxt arvadlar arasında ədalətlə rəftar etməyi bacarmazsınız.”*** (Nisa 4/129)

Yuxarıdakı ayələrdən birində ədalətli olma şərtilə birdən dördə qədər qadınla evlənməyə icazə verilərkən, digər ayədə bunun imkansız olduğu bildirilir. Təbii olaraq zahirən hər iki ayə bir-birinə zidd görünür. Ancaq bir ayədəki ədalətli olmaqdan məqsəd huquqi baxımdan, digər ayədəki ədalətdən qəsd olunan isə qəlbin hər ikisinə eyni səviyyədə olması yönündəndir. Əlbəttə ki, hər iki şəxslə huquqi yöndən ədalətli olmaq mümkündür. Ancaq hər iki insana eyni dərəcədə məhəbbət bəsləmək imkansızdır. Ona görə ki, qəlb ağıldan müstəqil hərəkət edir.

Quranda bir-birinə zidd, əks kimi görünən ayələri açıqlamaq üçün dilin incəliklərini yaxşı bilməklə yanaşı, eyni zamanda Qurana bütöv halda baxmaqla və Hz. Peyğəmbərin (s.ə.s.) sünnəsini əsas götürməklə mümkündür.

## XI. NASİX VƏ MƏNSUX

“Nəsx” lüğətdə “ortadan qaldırmaq, bir şeyi bir yerdən başqa bir yerə keçirmək, dəyişdirmək” mənalarına gəlir. Termin olaraq isə “şəri bir hökmü başqa bir şəri dəlillə ortadan qaldırmaq” deməkdir. Bundan əlavə, Qurani-Kərimin özündən əvvəlki səmavi kitabların hökmlərini qaldırmasına da “nəsx” deyilir.

Beləliklə, özündən əvvəlki hökmü qaldıran ayəyə “nasix”, hökmü qalxmış ayəyə “mənsux”, bu prosesə də “nəsx” deyilir.

Bu barədə Qurani-Kərimdə belə buyurulur:

**“مَا نَنْسَخْ مِنْ آيَةٍ أَوْ نُنْسِهَا نَأْتِ بِخَيْرٍ مِنْهَا أَوْ مِثْلِهَا أَلَمْ تَعْلَمْ أَنَّ اللّٰهَ عَلَىٰ كُلِّ شَيْءٍ قَدِيرٌ / *Biz*** *(zaman, məkan və şəraitin tələbinə görə)* ***hər hansı bir ayəni*** *(ayənin hökmünü)* ***ləğv edir və ya onu unutdururuqsa, ondan daha yaxşısını, yaxud ona bənzərini gətiririk. Allahın hər şeyə qadir olmasını bilmirsənmi?!”*** (Bəqərə, 2/106)

Başqa bir ayədə Allah-Təala belə buyurur:

وَإِذَا بَدَّلْنَا آيَةً مَكَانَ آيَةٍ وَاللّٰهُ أَعْلَمُ بِمَا يُنَزِّلُ قَالُوا إِنَّمَا أَنْتَ مُفْتَرٍ بَلْ أَكْثَرُهُمْ لَا يَعْلَمُونَ

***“Biz bir ayənin yerinə digər bir ayəni gətirdikdə*** *(bir ayənin hökmünü ləğv edib onu başqası ilə əvəz etdikdə)* ***– Allah nə nazil etdiyini*** *(hansı hökmün bəndələri üçün daha münasib olduğunu)* ***Özü daha yaxşı bilir –*** *(Kafirlər Muhammədə)**: “Sən ancaq bir iftiraçısan*** *(Allahın adından yalan uydurursan!)****” – deyərlər. Xeyr! Onların əksəriyyəti*** *(cahil olduğu üçün əsl həqiqəti, bir hökmü başqası ilə əvəz etməyin hikmətini)* ***bilməz!”*** (Nəhl 16/101)

Nəsx məsələsi hər yönüylə alimlər arasında fikir birliyi, olmasa da, aşağıdakı iki xüsusda onlar həmrəy olmuşlar.

1. Nəsx məsələsi dinin təməl əsasları, yəni inançla əlaqəli yox, dinin dünya ilə bağlı hökmlərini əhatə edir.

2. Nəsx Quranın özündən əvvəlki kitabların inancla əlaqəli hökmlərindən başqa digər hökmləri qüvvədən düşürməsidir. Məsələn, yəhudi inancına görə şənbə günü iş görmək haram idi. Ancaq İslam dini bu hökmü aradan qaldırmışdır.

Quranı düzgün təfsir etmək üçün nəsx məsələsini bilməyin vacib olduğunu Hz. Əlinin qazıya verdiyi sualdan başa düşmək olur. Belə ki, Hz. Əli bir gün qazıya: “Nasix və mənsuxu bilirsənmi?” -deyə sual soruşanda, Qazı: “Xeyr!” -deyərək cavab verir. Bunun müqabilində Hz. Əli: “Elə isə sən özünü də, başqalarını da məhv etdin”, -demişdir.

Nəsx yuxarıda da qeyd olunduğu kimi etiqadi yox, ibadət və müamilatla bağlı hökmlərdəndir. Bu da Uca Allahın insanlara olan rəhmətinin nəticəsidir. Ona görə ki, cəmiyyət, özlərinə ağır gələn hökmləri tədricən yerinə yetirməyi öyrənmiş və həmin hökmə əməl etmək onlar üçün çətin olmamışdır. Məsələn, içkinin tədricən haram buyurulması bunun ən gözəl nümunələrindəndir.

İçki içmək müşrik ərəblər arasında çox yayılmışdı idi. Qurani-Kərim bu pis vərdişə bir anda qəti bir əmrlə qadağa qoymamışdır. Əksinə, cəmiyyəti tərbiyə edərək onu tədricən aradan qaldırmaq istəmişdir. Birinci addımda içkinin zərərindən bəhs etmiş, ancaq bəzi faydalarının da olduğunu inkar etməmişdir. Bu xəbərdarlıqla Allah-Təala içkinin əslində zərərli bir şey olduğu fikrini müsəlmanların şüur altına yerləşdirmişdir. İkinci addımda, içkili halda namaz qılmağı haram etmişdir. Gündə beş vaxt namaz qılındığını nəzərə alanda və hər bir namazın digər namazla arasındakı vaxtın ort hesabla 4-5 saat olduğunu fikirləşəndə bu hökmlə Allah-Təala müsəlmanlara demək olar ki, gündüz içki içməyi tamamiylə məhdudlaşdırmışdır. Beləliklə, müsəlmanlar içkinin haram edilməsinə hazır olmuşlar. Nəhayət, içki içmək müsəlmanlara aşağıdakı ayə ilə qəti olaraq haram buyurulmuşdur:

***“Ey iman gətirənlər! Şərab da*** *(içki də)**, qumar da, bütlər də, fal oxları da Şeytan əməlindən olan murdar bir şeydir. Bunlardan çəkinin ki, bəlkə, nicat tapasınız.”*** (Maidə, 5/90)

Əlbəttə Allah-Təala istəsəydi bəri başdan içkini müsəlmanlara haram edə bilərdi. Haşa, Uca Allah içkinin haram edilməsi qərarına sonradanmı gəldi? Yeri, göyü yaradan və hər şeydən xəbərdar olan bir yaradıcı haqqında bunu fikirləşmək təbii ki, absurddur. Sadəcə olaraq Uca Allah insanlara ağır gələn hökmləri onlara olan rəhməti səbəbi ilə tədricən qadağan etmişdir.

Bir də insanların mənafeyinə uyğun olaraq qoyulmuş bir hökm bir müddət keçdikdən sonra insanların mənafeyinə daha uyğun olan başqa bir hökm qoyulmaqla nəsx hadisəsi baş vermişdir.

| ARAŞDIRIB QARŞILAŞDIRIN! | | |
|---|---|---|
| **Mərhələlər** | **İçkinin haram edilməsi** | **Faizin haram qılınması** |
| **I Mərhələ** | Bəqərə, 2/219 | |
| **II Mərhələ** | Nisa, 4/43 | |
| **III Mərhələ** | Maidə, 5/90-91 | |

Faizin haram edilmə mərhələlərini Rum, 30/39; Nisa, 4/160-161; Ali İmran, 3/130; Bəqərə, 2/275-279-cu ayələrdən araşdıraraq içkinin haram edilməsini nümunə götürərək boşluğu doldurun.

## XII. QİSSƏLƏR

"Qissə" sözünün lüğətdəki mənası "birinin izini sürərək arxasından getmək və bir sözü birinə açıqlamaq"dır. Quran qissələri tarixdə olmuş və dərs götürülməli olan həqiqi hadisələrdir.

Quran insanı tərbiyə edərkən danışıq üslubunu zənginləşdirən və mücərrəd həqiqətlərin başa düşülməsini asanlaşdıran qissələri bir metod olaraq çox istifadə etmişdir.

Qurani-Kərimdə keçmişdə yaşamış peyğəmbərlərdən və onların ümmətlərindən bəhs edən çoxlu sayda qissələr vardır. Quranda qissələrin mövcud olması oxuma və yazma bilməyən Hz. Muhammədin (s.ə.s) peyğəmbərliyinin sübutlarındandır. Çünki bu qissələri Hz. Peyğəmbərimiz anladarkən onun düşmənləri olan yəhudilər həmin qissələrin bəhs etdiyi hadisələri təkzib etməmişlər. Bir ümmi olan Peyğəmbərimizin bütün bu dəqiq məlumatları verməsi, əlbəttə ki, onun Allahın peyğəmbəri olduğunun dəlillərindəndir.

Qissələrdən məqsəd Hz. Peyğəmbərimizin nübüvvətini (peyğəmbərliyinə) isbat etməklə yanaşı, möminləri təsəlli etmək, insanları tərbiyə etmək, səmavi dinlərin əsasının bir olduğunu bəyan etmək və həmin hadisələrdən ağıl sahiblərinin ibrət almalarını təmin etmək olmuşdur. Bu barədə Quranda belə buyurulur:

***"(Peyğəmbərlərin) hekayətlərində ağıl sahibləri üçün, sözsüz ki, bir ibrət vardır"*** (Yusuf, 12/111)

Qissələrin təsəlli xarakterli olması ondan irəli gəlir ki, həmin qissələrdə əvvəlki ümmətlərin imanlarından ötrü çox böyük əzab-əziyyətə düçar olunduqlarından bəhs olunur. Bu da möminlərdə əvvəlki ümmətlərin onların çəkdikləri əziyyətlərdən daha da ağırını gördüklərini biləndə müşriklərin onlara verdikləri əziyyətlərə qarşı dözümlülük yaradırdı. Bir də bütün bu əziyyətlərin nəticəsində Allah-Təala tərəfindən həm bu dünyada, həm də o biri dünyada mükafatlandırılacaqları ümidi aşılanırdı.

İnsan oğlu tələskən yaradılmışdır. Bunun üçün nail olmaq istədiyi hədəfə tez çatmaq istəyir. Amma hədəfin

ARAŞDIRARAQ ÖYRƏNƏK

**Fil qissəsi:**
Fil, 105/1-5;

**Hz. Adəm-şeytan qissəsi:**
Araf, 7/11-26;

**Hz. Loğman qissəsi:**
Loğman, 31/12-19;

**Hz. Musa qissəsi:**
Qəsəs, 28/22-28;

**Hz. İbrahim və atasının qissəsi:**
Məryəm, 19/41-50;

**Əshabi-Kəhf qissəsi:**
Kəhf, 18/10-18

Yuxarıda qeyd edilən qissələrdən ikisini oxuyun və həmin qissələrdə hansı məqamlara toxunulduğunu sinifdə anladın.

çətinliyi, zamanın uzanması, planda olmayan hadisələrin meydana gəlməsi və buna bənzər bir çox problemlər insanı məqsədinə çatmaqdan uzaqlaşdıran, həvəsini öldürən və əzmini yox edən səbəblər olmuşdur. Bütün bu mənfiliklərə qarşı insanda müsbət enerji yaratmaq üçün Uca Allah çox böyük çətinliklərlə üzləşdikləri, əzab əziyyətə düçar olduqları halda, nəticədə hədəflərinə çatan şəxsiyyətlərin qissələrindən nümunələr verərək başda Hz. Peyğəmbər olmaqla bütün müsəlmanlara iradə möhkəmliyi aşılamışdır. Qurani-Kərimdə bu haqda belə buyurulur: ***"****(Ya Rəsulum!)* ***Biz peyğəmbərlərin xəbərlərindən*** *(başlarına gələnlərdən)* ***ürəyini möhkəmləndirəcək*** *(qəlbinə qüvvət verəcək)* ***nə varsa,*** *(hamısını)* ***sənə nağıl edirik."*** (Hud, 11/120)

Fərd və cəmiyyətin Uca Allahın muradı yönündə tərbiyə edilməsi üçün endirilən Qurani-Kərimin dörddə birinə yaxın hissəsinin qissələrdən ibarət olması, onların tərbiyədəki rolunun nə qədər əhəmiyyətli olduğunu göstərir.

Məsələn; təkəbbür və inadın, sahibini lənətə düçar etdiyi həqiqətin Adəm (əs) ilə şeytan arasında keçən hadisədə obrazlaşdırılır. Həmin qissədə şeytan özünün Adəmdən üstün olduğunu, bunun üçün ona səcdə etməyəcəyini deyərək təkəbbürlük nümayiş etdirmiş və nəticədə Uca Allahın lənətinə düçar olmuşdur.

Məhv olan qövmlər Quranda tez-tez təkrar olunaraq onların məhv olmalarının səbəbləri bildirilir. Bunun üçün Uca Allahın xəbərdarlıqlarına, mesajlarına qarşı üz çevirmənin nələrə səbəb olduğunu xüsusi ilə İsrail oğulları misal gətirilərək dəfələrlə anladılır.

Vəfa, sədaqət, peşmanlıq, yardımlaşma kimi əxlaqi normalar, eləcə də, kin, həsəd, paxıllıq kimi mənfi xarakterlər Habil, Qabil və Yusif qissəsində çox gözəl şəkildə izah olunur.

Həmçinin bəzi çətin anlaşılan mövzuların bu qissələrlə insanlar tərəfindən daha rahat anlaşılması təmin olunur. Beləliklə də, Qissələr vasitəsi ilə insanlarda dini fikir formalaşır.

Məsələn; Quranda bir bağ sahibindən bəhs edilir. Bu bağ sahibi insanlara çox yardım edərmiş. Hər il bağdan topladığı meyvələrdən bir qismini mütləq kasıblara paylayarmış. Hətta bu elə bir adət almış ki, məhsulun toplandığı vaxt ehtiyac sahibləri həmin xeyirxah şəxsin bağına yığışar, paylarına düşəni alarlarmış. Bir gün həmin adam digər insanlar kimi bu fani dünyadan köçür. Bundan sonra onun oğulları atasının etdiyi yaxşı əməlləri davam etdirərlərsə, kasıb olacaqlarını düşünürlər. Bu səbədən meyvə yığımı vaxtı gəlib çatanda insanlar görməsinlər deyə meyvələri gecə toplamaq üçün vədələşirlər. Amma gecə məhsulu yığmağa gəldiklərində bağın yanıb kül olduğunu görürlər.

Bu qissə ilə Uca Allah insanlara yaxşılıq etməyin insanları yoxsullaşdırmadığını, əksinə yaxşılıq etməyin yüksək əxlaqi keyfiyyət olduğunu və Allah yolunda xərclənən malda bərəkət olduğunu təlqin edir.

Beləliklə, qissələrlə Uca Allah başda Hz. Peyğəmbər olmaqla bütün möminlərə imanlarında sabit-qədəm olmaları üçün onlara güc-qüvvət aşılayır, onlara təsəlli edir, verir, ümid verir, ibrət almalarını təmin edir, eləcə də dini tərbiyəni insanlar arasında təbliğ edir, fərd və cəmiyyətdə dəyişməyən psixoloji və sosioloji qaydaları təlqin edir, ən əsası bütün dini əmr və qadağaları bu qissələr vasitəsi ilə insanların həm zehinlərinə, həm də ruhlarına yerləşdirir.

Allah yolunda xərclənən malın azalmadığı, əksinə artdığını "Bəqərə" surəsinin 261-ci ayəsini oxuyaraq təfəkkür edin!

## XIII. QURANIN FƏZİLƏTLƏRİ

Fəzilət "üstünlük" və "şərəf" mənalarına gəlir. Ümumi mənada Quranın fəziləti, xüsusi mənada isə bəzi surə və ayələrin fəzilətləri haqqında Hz. Peyğəmbərimizin hədisi-şərifləri vardır. Bunlardan bəziləri aşağıdakılardır:

*"Sözlərin ən xeyirlisi Allahın kitabıdır."*

*"Sizin ən xeyirliniz Quranı öyrənən və onu öyrədəndir."*

*"Hafizəsində Qurandan heç bir şey olmayan insan xaraba qalmış bir ev kimidir."*

*"Kim Quranı oxuyar və içindəkilərə əməl edərsə, qiyamət günü onun valideyinlərinin başına bir tac qoyular. Bu tacın işığı, günəş aranızda olsa, onu dünyadakı bir evə qoyulduğunda saçacağı işıqdan daha gözəldir. Elə isə, sizcə, Qurani-Kərimə əməl edən adamın vəziyyəti necə olar?"*

*"Evlərinizi Qurandan uzaq tutaraq qəbirlərə çevirməyin. Bunu bilin ki, şeytan içində "Bəqərə" surəsi oxunan evdən ürküb qaçar."*

*"Kim "Kəhf" surəsinin başından on ayə əzbərləyərsə, Dəccaldan qorunmuş olar.*

## XIV. QURANIN ECAZKARLIĞI

"Ecaz" kəlməsi "aciz qoymaq" mənasına gəlir. "Quranın ecazkarlığı" deyildikdə isə "onun bütün insanları və cinləri öz bənzərini gətirməkdə aciz qoyması" anlaşılır. Bununla əlaqədar Qurani-Kərimdə belə buyurulur:

قُلْ لَئِنِ اجْتَمَعَتِ الْإِنْسُ وَالْجِنُّ عَلَىٰ أَنْ يَأْتُوا بِمِثْلِ هَٰذَا الْقُرْآنِ لَا يَأْتُونَ بِمِثْلِهِ وَلَوْ كَانَ بَعْضُهُمْ لِبَعْضٍ ظَهِيرًا

*"(Ya Peyğəmbərim!)* ***De: "Əgər insanlar və cinlər bir yerə yığışıb bu Qurana bənzər bir şey gətirmək üçün bir-birinə kömək etsələr, yenə də ona bənzərini gətirə bilməzlər"***. (İsra 17/88)

Uca Allah bütün peyğəmbərlərinə zamanın şərtlərinə uyğun olaraq peyğəmbərliklərinin sübutu kimi möcüzələr göstərməyi bəxş etmişdir. Məsələn, Hz. İsanın (əs) ölüləri diriltməsi, Hz. Musanın (əs) asasısının ilana çevrilməsi, Nil çayını ikiyə ayırması bunlardandır. Hz. Muhammədin (s.ə.s.) də müxtəlif möcüzələrinin yanında ən böyük möcüzəsi Qurani-Kərimdir. Bu haqda Allah-Təala belə buyurur:

وَقَالُوا لَوْلَا أُنْزِلَ عَلَيْهِ آيَاتٌ مِنْ رَبِّهِ قُلْ إِنَّمَا الْآيَاتُ عِنْدَ اللَّهِ وَإِنَّمَا أَنَا نَذِيرٌ مُبِينٌ

أَوَلَمْ يَكْفِهِمْ أَنَّا أَنْزَلْنَا عَلَيْكَ الْكِتَابَ يُتْلَىٰ عَلَيْهِمْ إِنَّ فِي ذَٰلِكَ لَرَحْمَةً وَذِكْرَىٰ لِقَوْمٍ يُؤْمِنُونَ

***"****(Müşriklər:)* ***"Bəs nə üçün Rəbbindən ona*** *(başqa peyğəmbərlər kimi)* ***möcüzə nazil olmadı?" – dedilər.*** *(Ya Rəsulum!)* ***De: "Möcüzələr ancaq Allahın əlindədir. Mən isə sadəcə olaraq*** *(insanları Allahın əzabı ilə)* ***açıq-aşkar qorxudan bir peyğəmbərəm! Məgər*** *(müşriklər)* ***oxunmaqda olan Kitabı sənə nazil etməyimiz onlara kifayət etmədimi? Həqiqətən, bunda iman gətirən bir tayfa üçün həm mərhəmət, həm də öyüd-nəsihət*** *(ibrət)* ***vardır!"*** (Ənkəbut, 50-51)

Qurani-Kərim nazil olduğu vaxt ərəb dilinin və ədəbiyyatının ən zirvə nöqtəsində olduğunu fikirləşəndə yuxarıdakı ayəni daha yaxşı başa düşmək olur. Çünki ərəblər öz bəlağətləri və fəsahətləri, natiqlik qabiliyyətləri ilə fərqlənmiş, gözəl şeir nümunələri ortaya qoymuşdular. Bütün bunlara baxmayaraq, Quranın onlara, özünün oxşarını gətirmələrini tələb edərək meydan oxuması qarşısında onlar sadəcə olaraq susmuşdular. Hətta Qurani-Kərim nazil olduğu vaxt məşhur şair olan İmrul Qeysin şeir müsabiqəsində yer tutduğuna görə Kəbəyə asılmış şeirini öz qızı, artıq

bu şeir öz qüdrətini və mənasını itirdi deyərək qoparmışdır.



Quranı Kərimin möcüzə oluşuna dəlalət edən yönlərdən biri olan elmi kəşflərin önündə getdiyinə dair iki nümunə gətirərək yoldaşlarınızla müzakirə edin.

Əlbəttə, Qurani-Kərimin ecazkarlığını, sadəcə, onun bəlağətində axtarmaq düzgün deyildir. Onun ecazkarlığı müxtəlif yönlüdür. Qurani-Kərimin endirildiyi gündən indiyə kimi bir hərfinin belə dəyişilməməsi, insanı bütün yönləri ilə islah etmə metodunda bənzərsiz olması, hər bir ayə və surələrin düzülüşündəki uyğunluq və məna gözəlliyi, eyni zamanda səslənəndə insanı məftun edən musiqisi  və bizə məlum olan və olmayan daha bir çox tərəfdən möcüzəliliyi vardır.

Bütün bunlarla yanaşı aşağıda Quranın ecazkarlığını göstərən ən önəmli üç maddəni qeyd edirik:

**1. Qeybdən xəbər verməsi**

Qurani-Kərim Allah kəlamı olduğuna görə onun üçün keçmiş zaman da, indiki və gələcək zamanlar da eyni olmuşdur. Buna görə Qurani-Kərimdə müşrikləri heyrətə salan keçmişdən verilən xəbərlərin yanında gələcəklə də əlaqədar bir çox hadisələr möcüzəvi şəkildə bildirilmişdir.  Bunlarla bağlı aşağıdakı nümünələri vermək olar:

Hz. Musa (əs) ilə əlaqədar olaraq Qurani-Kərimdə belə buyurulur:

***“****(Ya Rəsulum!)* ***Biz Musaya vəhy etdiyimiz*** *(peyğəmbərlik bəxş edib Firon əhlinin yanına getməsini buyurduğumuz)* ***zaman sən*** *(Tur dağının)* ***qərb tərəfində*** *(Musanı gözləyənlər arasında)* ***deyildin. Sən*** *(buna)* ***şahid olanlardan da deyildin!*** *(Sənin yəhudilərə və ərəb müşriklərinə bu xəbərləri doğru söyləməyin yalnız Allahdan nazil olan vəhylərdir!)* ***Lakin Biz*** *(Musadan sonra)* ***neçə-neçə nəsillər yaratdıq. Onlar uzun ömür sürdülər.*** *(Vəhy kəsildi; bir çox xəbərlər unudulub getdi, şəriət təhrif olundu)****. Sən ayələrimizi onlara oxuyarkən Mədyən əhli arasında deyildin.*** *(Sən Mədyəndə deyildin ki, onların əhvalını bilib Məkkə əhlinə xəbər verəsən. Buna görə də onlar sənin bu xəbərləri Mədyən camaatından öyrəndiyini deyə bilməzlər)****. Lakin Biz*** *(bu əhvalatları onlara olduğu kimi xəbər vermək üçün səni)* ***peyğəmbər göndərdik.*** *[Və ya: Ancaq (bu xəbərləri sənə) göndərən Bizik]****. Və Biz*** *(Musaya)* ***xitab etdiyimiz*** *(Tövratı verdiyimiz)* ***zaman da sən Tur dağının yanında deyildin. Lakin səndən əvvəl özlərinə peyğəmbər gəlməmiş bir tayfanı*** *(Allahın əzabı ilə)* ***qorxudasan deyə, Rəbbindən bir mərhəmət olaraq*** *(sənə bunları öyrədib onlara peyğəmbər göndərdik)****. Bəlkə, öyüd-nəsihət qəbul etsinlər!”*** (Qasas, 44-46)

Qurani-Kərimdə bunun kimi keçmişlə əlaqədar qissələr, hadisələr çoxdur. Hz. Adəmin (əs), yaradılışından, şeytanın ona və onun timsalında insanlığa qarşı düşmənçiliyindən, eləcə də kainatın, məxluqatın  yaradılışından və s. keçmişlə əlaqədar çoxlu sayda xəbərlər verilmişdir.

Qurani-Kərimdə indiki və gələcək zamanla da bağlı xəbərlər verilmişdir. Peyğəmbərimizin yanında yer alıb, amma münafiqlik edənlərin əsas üzlərinin Peyğəmbərimizə (s.ə.s.) xəbər verilməsi, həmçinin gələcəkdə Rumlarla İranlılar arasında baş verəcək savaşın İranlıların məğlubiyyəti ilə bitəcəyindən xəbər verməsi, Əbu Ləhəbin və onun arvadının iman gətirmədən öləcəklərini bildirməsi bunlardandır. Hətta Əbu Ləhəb haqqındakı bu məlumat Quranın Allahın kəlamı olması baxımından ən böyük dəlildir. Baxmayaraq ki, Əbu Ləhəb kimi İslama düşmən kəsilənlərdən müsəlman olanlar olmuşdur. Məsələn, Əbu Sufyan və Vəhşi beləlorindəndir. Belə olan təqdirdə Əbu Ləhəbin də müsəlman olmasında bir maneə görülmür. Ancaq buna baxmayaraq, Allah-Təala qəti şəkildə Əbu Ləhəbin kafir olaraq öləcəyini bildirmiş, həqiqətən, belə də olmuşdur.

## 2. Elmi kəşflərdən xəbər verməsi

Qurani-Kərimin ecazkarlığını göstərən amillərdən biri də onun elmi kəşflər barəsində məlumatlar verməsidir. Fizika, kimya, astronomiya, psixologiya, tibb kimi sahələrlə əlaqədar 700-dən çox ayə vardır.

Aşağıda bununla bağlı Qurani-Kərimdən verilən nümunələr diqqəti çəkicidir:

Yerin və göyün yaradılışı və canlıların nədən yaradıldığını Uca Allah belə izah edir:

***"Məgər kafir olanlar göylə yer bitişik ikən Bizim onları ayırdığımızı, hər bir canlını sudan yaratdığımızı bilmirlərmi?! Yenə də iman gətirməzlər?*** *(Göylər ilk yaradılışda bir-birinə bitişik bir təbəqə olduğu halda, onların arası hava ilə açılıb yeddi təbəqəyə ayrılmış, yer də bir təbəqə ikən sonra yeddi təbəqəyə bölünmüşdür. Bu, Allahın qüdrətini, əzəmətini sübut edən ən tutarlı dəlillərdəndir).*" (Ənbiya, 21/30)

Həmçinin Qurani-Kərimin endiriliməsindən əsrlər sonra kəşf olunan kainatın davamlı genişlənmə hadisəsini Qurani-Kərim bizə 1400 il bundan əvvəl xəbər verərək ecazkarlığını ortaya qoymuşdur. Bununla bağlı ayədə belə buyurulur:

***"Biz göyü qüdrətimizlə*** *(qüdrət əlimizlə)* ***yaratdıq və Biz onu genişləndirməkdəyik."*** (Zəriyət 51/47)

Dağların göründüyü kimi dayanmadığı, əksinə, onun hərəkət halında olduğu Qurani-Kərimdə belə buyurulur:

***"****(O gün)* ***dağlara baxıb onları donmuş*** *(hərəkətsiz durmuş)* ***zənn edərsən, halbuki onlar bulud keçdiyi kimi keçib gedərlər. Bu, hər şeyi bacarıqla*** *(yerli-yerində)* ***edən Allahın gördüyü işdir. Həqiqətən, O, etdiyiniz*** *(bütün)* ***əməllərdən xəbərdardır!"*** (Nəml 28/88)



**3. Dil üslubu**

Qurani-Kərimdə istifadə olunan kəlmələr, onların düzülüşləri, səslənişi və s. o dərəcədə mükəmməldir ki, onu qəbul etməyən Məkkəli müşriklər belə Qurana qarşı heyranlıqlarını gizlədə bilməmişlər. Həmin müşriklərin böyüklərindən biri olan Vəlid b. Müğirə belə deyir: “Allaha and olsun ki, Məhəmməddən elə bir söz dinlədim ki, insan sözü desəm deyil, cin sözü desəm deyil! Elə bir şirinliyi, elə bir gözəlliyi vardır ki, insanı məftun edir. Bu, elə bir kəlamdır ki, üstü meyvəli, altı münbit və bərəkətlidir! O mütləq qalib gələcək və şübhəsiz ki, uduzmayacaqdır.”

Bundan əlavə, Məkkəlilərin içində sehri, kəhanəti və şeiri ən yaxşı bilənlərdən biri olan Utbə b. Rəbiə: “Vallahi, Muhamməddən elə bir söz dinlədim ki, indiyə qədər onun bir oxşarını heç eşitməmişəm. O nə şeir, nə sehr nə də kəhanətdir”, -deyərək Quranın onu öz üslubu ilə təsiri altına aldığını inkar etməmişdir.

Qurani-Kərimin istifadə etdiyi ləfzlər məna ilə o qədər uyumludur ki, bir kəlmə belə çıxarılsa həmin mənanı verən başqa bir kəlmə tapılmaz. Bu barədə məşhur alimlərdən olan İbn Ətiyyə belə deyir: “Quran elə bir kitabdır ki, ondan bir kəlmə alınsa, sonra ərəb dili alt-üst edilsə, ondan daha münasib bir kəlmə tapmaq mümkün olmaz.”

Qurani-Kərim insanın həm ağlına, həm də qəlbinə xitab etmişdir. Aşağıdakı ayə bunun ən açıq misallarından biridir: ***“Bir-birinizin qeybətini qırmayın! Sizdən biriniz ölmüş qardaşının ətini yeməyə razı olarmı?! Bu sizdə ikrah hissi oyadar*** *(qeybət də belədir)*. ***Allahdan qorxun. Həqiqətən, Allah tövbələri qəbul edəndir, rəhmlidir!”*** (Hucurat 49/12)

Əslində, ilk cümlə ilə qiybət haram edilmişdir. Amma Allah-Təala insanların qiybət etməkdən uzaq durmalarını, onu ürəkdən yerinə yetirmələri üçün onların ruhuna təsir etmək məqsədi ilə təşbehdən istifadə etmişdir. Bilindiyi kimi təşbehdən istifadə edəndə bənzəyənlə, bənzədilən arasında bir əlaqə olmalıdır. Buradakı əlaqə ölən adam ətinin yeyildiyini bilmədiyi kimi, qeybət olunan da onun haqqında danışılanı bilməz. Eyni zamanda burada insanın şərəf və namusu ölü ətinin haram olması kimi haram olmasına da diqqət çəkilmişdir. Göründüyü kimi Allah-Təala insanı haram olan şeydən uzaqlaşdırmaq üçün onun həm ağlına, həm də qəlbinə nüfuz etmişdir.

Qurani-Kərim iyirmi üç ildə hissə-hissə endirildiyi halda, ayə və surələr arasında mükəmməl bir ahəng vardır. Bunun bənzərini gətirməkdən aciz qalan Məkkəli müşriklər Quranın təbliğinə mane olaraq onun nurunu söndürmək istəmiş, lakin buna nail ola bilməmişlər. Bu barədə Allah-Təala Qurani-Kərimdə belə buyurur:

“يُرِيدُونَ أَنْ يُطْفِئُوا نُورَ اللَّهِ بِأَفْوَاهِهِمْ وَيَأْبَى اللَّهُ إِلَّا أَنْ يُتِمَّ نُورَهُ وَلَوْ كَرِهَ الْكَافِرُونَ“ / ***Onlar Allahın nurunu*** *(dəlillərini, islam dinini, Quranı)* ***ağızları*** *(batil sözləri)* ***ilə söndürmək istəyirlər. Allah isə kafirlərin xoşuna gəlməsə də, ancaq öz nurunu*** *(dinini)* ***tamamlamaq istər.”*** (Tövbə 9/32)

Quran düşmənləri Quranın oxunmasının və onun təbliğinin qarşısını ala bilmədə aciz qaldıqlarında, bu səfər onun oxunarkən eşidilməsinə mane olmaq istəmələrini Qurani-Kərim bizə belə xəbər verir:

“وَقَالَ الَّذِينَ كَفَرُوا لَا تَسْمَعُوا لِهَٰذَا الْقُرْآنِ وَالْغَوْا فِيهِ لَعَلَّكُمْ تَغْلِبُونَ“ / ***Kafir olanlar*** *(öz dostlarına)****: “Bu Quranı dinləməyin, o oxunduqda*** *(eşidilməsin deyə)* ***səs-küy*** *(şuluqluq)* ***salın ki, bəlkə,*** *(bununla Muhammədə)* ***qalib gələsiniz!” – dedilər.”*** (Fussilət 41/26)

Bütün bunlar ərəb dilinin zirvədə olduğu bir dövrdə bəlağətləri ilə öyünən Məkkəli müşriklərin Qurani-Kərimin qarşısında aciz qaldıqlarını göstərir. Bu da Quranın vəhy alana qədər oxuma və yazma bilməyən Hz. Muhammədin (s.ə.s.) özündən uydurduğu bir kəlam olmayıb, məhz Uca Allah tərəfindən nazil olduğunun sübutlarındandır.

## XV. QURANİ-KƏRİMDƏ TƏKRARLAR

Qurani-Kərimdə bəzən bir qissə, bəzən də bir ayə təkrar olunur. Bəzi avropalı şərqşünaslar Quranda təkrar olunan ayə və qissələri lüzumsuz hesab edərək, bunların bezdirici olduğunu irəli sürmüşlər. Halbuki, ərəb dili və bəlağətinin zirvəsinin yaşandığı həmin dövrdə bu formada təkrarlar mövcud olmuşdur. Qurani-Kərim də var olan bu üslubu daha gözəl və daha cazibəli şəkildə davam etdirmişdir.

Təkrar olan mövzular hər dəfə fərqli üslub və yönləri ilə anladıldığına görə Quranın səslənişinə və onun mənasına fərqli gözəlliklər qatmışdır. Peyğəmbərlərin həyatları fərqli surələrdə yeni üslublarla anladılmışdır. Hər dəfə hadisəyə fərqli yöndə baxılır və fərqli dərslər verilir. Məsələn, Hz. Adəmin (əs) qissəsinin təkrar olunduğu surələrdə Allahın nemətləri, bu nemətlərə qarşı insanların şükrünün az olması, insanın düşməninin şeytan olduğu, insanların zəif nöqtələri və s. kimi mövzuların hər dəfə bir qisminin anladılmasını misal göstərmək olar.

Təkrarlar təkrar edilən mövzunun əhəmiyyətini vurğulayır və ona diqqət çəkir. Keçmişdə olan hadisələrdən insanların ibrət alması təmin edilir, yaxşılığın və pisliyin nəticələri insanların gözləri önünə sərilərək onları tərbiyə edir.



### TAPIB YAZIN!

| AYƏLƏR | ECAZLIQ YÖNÜ |
|---|---|
| "Rumlar, yaxın bir yerdə yenildilər. Onlar yenildikdən sonra bir neçə il içində qalib gələcəklər..." (Rum, 30/2-5) | Keçmiş və gələcəkdən xəbər verir |
| Bəqərə, 2/23-24;<br>Ənbiya, 21/30;<br>Ənfal, 8/31-32;<br>Yunus, 10/15,38 | ..........................................................<br>..........................................................<br>..........................................................<br>.......................................................... |

Yuxarıdakı ayələrin möcüzəvi yönlərini tapın
və nümunədə göstərildiyi kimi boşluqları doldurun.

## XVI. VÜCUH VƏ NƏZAİR

"الْوُجُوه / vücuh" kəlməsinin lüğətdə "yön, tərz", "üz", "fikir, görüş" və s. mənalarda işlənir. Termin olaraq isə "bir kəlmənin fərqli mənalarda işlənməsinə" deyilir. Dilimizdə bunun adı amonimdir. Buna misal olaraq "qol" kəlməsini götürsək, burada "qol" kəlməsi həm insanın qolu, həm də imza mənasında işlənir.

Qurani-Kərimdən bu haqda bir çox misallar vermək mümkündür. Aşağıda verilənlər "الْهُدي / hüda" kəlməsinin fərqli mənalarda istifadə olunduğunu göstərən nümunələrdir:

*Bəyan (Bəqərə 2/5)*
*Din, yol (Ali İmran 3/73)*

*Quran (Nəcm 53/23)*

Yenə aşağıda göstərilənlər “طاغُوت / tağut” sözünün fərqli mənalarıdır:
*Büt (Nəhl 16/36)*
*Şeytan (Bəqərə 2/256)*

“النظائِر / nəzair” sözü lüğətdə “bənzər”, “dənk”, “paralelində olan” kimi mənalara gəlir. Termin olaraq da “Qurandakı fərqli kəlmələrin eyni mənanı daşıması” anlamındadır. Dilimizdə bunun qarşılığı “sinonim”dir. “tez”, “sürətli” “təcili” kimi sözlər bunun nümunələridir.

Qurani-Kərimdən bununla bağlı, yəni yazılışı və deyilişi fərqli olub, ancaq mənası eyni və ya yaxın kəlmələrdən bir neçəsi nümunə olaraq aşağıda verilmişdir:

Aşağıdakı sözlərin hamısı Quran mənasını daşıyır:

*Kitab (Bəqərə 2/2)*
*Furqan (Furqan 25/1)*
*Zikr (Hicr 15/9)*

Vücuh və Nəzairin içində yer alan kəlmələr Quranın gözəlliyini, bəlağətını, üslubunu və nəticə etibarilə dinləyicinin dinləmə zövqünü zənginləşdirmişdir. Bu kəlmələri bilmək Quranı düzgün başa düşməyi asanlaşdırır və səhv anlaşılmanın qarşısını alır.

## XVII. QİRAƏT

“القرائة / qiraət” sözü lüğətdə “oxumaq, tilavət etmək” mənasına gəlir. Termin olaraq isə “Quran kəlmələrinin oxunuşundakı mədd, qəsr, hərəkə, sükun, nöqtə və erab yönündəki fərqlilikləri ravilərinə isnad edərək bildirən elmdir.”

## XVIII. QURANİ-KƏRİMDƏ YƏMİNLƏR (andlar)

Qurani-Kərimdə çoxlu sayıda yəminlər vardır. Bunların bəzisində Allah-Təala öz uca adına and içir, bəzən peyğəmbərlərə, onların çıxdıqları yerlərə, Qurana, mələklərə, qiyamət gününə, bəzən də səma, günəş, ay, ulduz kimi kainatda olan mühüm varlıqlara, bəzən də zeytun, əncir, xurma, Tur dağı kimi təbiətdə olan şeylərə and içir.

Qurani-Kərimdə yəminlərin olmasının səbəblərindən bir neçəsi aşağıdakılardır:

1. İslam dini gəlmədən əvvəl ərəblərin ictimai həyatında and içmənin əhəmiyyəti böyük idi. Qurani-Kərim də onların dilində endirildiyi üçün onların istifadə etdikləri dil üslubundan istifadə etmişdir.

2. Allah-Təala endirdiyi ayələri bu yəminlərlə təyid etmişdir.

3. Yəmin bəzən and içilən şeyin qiymətini vurğulamaq və onun qədrini ucaltmaqdır.

Qurani-Kərimdə 17 surə yəminlə başlayır və beləcə, oxucunun diqqətini əvvəlcədən özünə cəlb edir.

Qurani-Kərimdəki yəminlərdən bəzilərini aşağıda qeyd etmək olar:

فَوَرَبِّكَ لَنَسْأَلَنَّهُمْ أَجْمَعِينَ

*“(Ya Rəsulum!)* ***Rəbbinə and olsun ki, Biz onların hamısını*** *(bütün məxluqatı)* ***sorğu-suala çəkəcəyik”*** (Hicr 15/92)

وَالذَّارِيَاتِ ذَرْوًا فَالْحَامِلَاتِ وِقْرًا فَالْجَارِيَاتِ يُسْرًا فَالْمُقَسِّمَاتِ أَمْرًا إِنَّمَا تُوعَدُونَ لَصَادِقٌ

*“(Toz-torpağı)* ***sovurub-dağıdan küləklərə; Asanlıqla üzüb gedən gəmilərə; Və ruzi bölən*** *(hərəsi bir işə müvəkkil olan)* ***mələklərə and olsun ki, Sizə vəd olunan*** *(qiyamət)* ***həqiqətdir*** *(mütləq vaqe olacaqdır)”***.** (Zəriyət 51/1-5)

وَالتِّينِ وَالزَّيْتُونِ وَطُورِ سِينِينَ وَهَٰذَا الْبَلَدِ الْأَمِينِ لَقَدْ خَلَقْنَا الْإِنْسَانَ فِي أَحْسَنِ تَقْوِيمٍ

***“And olsun əncirə və zeytuna; And olsun*** *(Allah-təalanın Musa ilə danışdığı)* ***Tur dağına; And olsun bu təhlükəsiz*** *(qorxusuz-xətərsiz)* ***şəhərə*** *(Məkkəyə)* ***ki, Biz insanı ən gözəl biçimdə yaratdıq!”*** (Tin 95/1-4)

Qurani-Kərimdəki yəminlərlə bağlı yazılan əsər VIII əsr alimlərindən olan İbn Qəyyim əl-Cövziyyənin (ö. 751/1350) “ət-Tibyan fi Əqsamil-Quran” adlı əsəridir.

## ÜÇÜNCÜ FƏSİLƏ AİD SUALLAR

**Aşağıdakı suallara izahlı cavablar verin.**

1. *Quranın anlaşılmasında Quran elmlərinin əhəmiyyətini açıqlayın*
2. *Quran elmlərinin ortaya çıxışı ilə bağlı məlumat verin.*
3. *Mütəşabehin mənasını açıqlayın*
4. *Qurani-Kərimdə mütəşabeh ayələrin olmasının insanlara faydasını açıqlayın.*
5. *Nəsxin Quranda varlığının hikmətlərindən danışın?*
6. *Vücuh və nəzairin mənası nədir?*

**Aşağıdakı sualların düzgün cavablarını işarələyin.**

***1. Qurani-Kərim neçə ilə nazil olmuşdur?***

A) 23 B) 22,5 C) 40 D)21

***2. "Elindən obasından uzaq olan", "qapalı olan", "dostu olmayan" anlamına gələn söz aşağıdakılardan hansıdır?***

A) Mücməl B) mübhəm C) qərib D) mütəşabeh E) mübəyyən

***3. "qapalı", "anlaşılmaz" mənasına gələn söz aşağıdakılardan hansıdır?***

A) mücməl B) mübhəm C) qərib D) mütəşabeh E) mübəyyən

***4. "Bir araya gətirilmiş, qısa ifadə edilmiş" mənasına gələn söz aşağıdakılardan hansıdır?***

A) mücməl B) mübhəm C) müşkül D) mütəşabeh E) mübəyyən

***5. "Qarışıq, bir-birinə zidd olan şey" anlamına gələn söz aşağıdakılardan hansıdır?***

A) mücməl B) mübhəm C) qərib D) mütəşabeh E) müşkül

***6. əl-Müfrədat fi Qaribil-Quran adlı əsər aşağıdakılardan hansına aiddir?***

A) el-Fərra B) Əxfəş əl-Əvsat C) əz-Zəccac

D) Məmər bin əl-Müsənna E) Rağıb əl-İsfahani



# IV FƏSİL
# QURANI ANLAMA VƏ YORUMLAMA

1. Qurani-Kərimi yaxşı anlamaq üçün hansı xüsusiyyətlərə diqqət yetirilməlidir?
2. Sünnənin Quranı anlamadakı mövqeyi haqqında düşünün.
3. Quranın ana mövzularını araşdırın.
4. Yunus 12, Fussilət 49 və Məaric 19-21 nömrəli ayələr üzərində fikir mübadiləsi aparın.

## I. QURANI ANLAMAQ VƏ YORUMLAMAQ ÜÇÜN ƏSAS QAYDALAR

İnsanlar üçün hidayət rəhbəri olaraq endirilən Quran başa düşülməli və həyata tətbiq edilməlidir. Quranın düzgün başa düşülməsi üçün əlbəttə ilk növbədə onu təbliğ edən Hz. Peyğəmbərimizin (s.ə.s.) onu necə yorumladığına baxmaq lazımdır. Hz. Muhamməd (s.ə.s.) Quranı insanlara təbliğ etmiş, onu açıqlamış və həyatına tətbiq edərək əshabına canlı Quran olmada nümunə olmuşdur. Belə ki bu haqda Hz. Aişəyə (r.ənha) Peyğəmbərimizin həyatı haqqında soruşanda: “Siz heç Quran oxumursunuzmu? Onun yaşantısı canlı Qurandır”, -deyərək cavab vermişdir.

İslamiyyətin qısa müddətdə dünyanın müxtəlif coğrafiyalarına yayılması nəticəsində bəzi ehtiyaclar meydana gəlmişdir. Həmin ehtiyacları qarşılamaq üçün Quranı doğru şəkildə yorumlamaq məcburiyyəti yaranmışdır. Quranı düzgün təfsir etmək üçün də təbii olaraq bəzi qaydalara riayət etmək lazımdır. Həmin qaydalar aşağıdakılardır:

## II. QURANI ÖZ BÜTÜNLÜYÜ İÇİNDƏ ANLAMA

Buna Quranı Quranla təfsir etmək də deyə bilərik.  Quranı təfsir edərkən diqqət edilməli olan xüsuslardan biri ayədə keçən bir kəlməni həm ayənin daxilindəki mənanı nəzərə almaq, həm də Quranda həmin  kəlmənin hansı mənalarda istifadə olunduğunu araşdırmaq lazımdır. Çünki Quranın bir ayəsində qısa şəkildə yer verilərn bir mövzu başqa ayədə daha ətraflı anladılmışdır. Bunun da səbəbi Quranın mövzulara görə tərtib edilmiş bir kitab olmamasıdır. Bunun üçün də bir məsələ bir ayədə yekunlaşdırılmamış, yerinə görə fərqli ayələrdə həmin mövzunun fərqli yönləri anladılmışdır. Bu səbəbdən Quranı həmişə bütöv ələ almaq lazımdır. Bu üsula diqqət edilmədiyi təqdirdə Quran ya əskik yozumlanar, ya da səhv başa düşülər. Quranın Quranla təfsirinə aşağıdakı ayələri misal göstərmək olar.

### 1. Bir yerdə üstü örtülü xüsusların başqa yerdə açıqlanması haqqında:

اهْدِنَا الصِّرَاطَ الْمُسْتَقِيمَ

***“Bizi doğru** (düz) **yola yönəlt!”*** (Fatihə, 1/6)

صِرَاطَ الَّذِينَ أَنْعَمْتَ عَلَيْهِمْ غَيْرِ الْمَغْضُوبِ عَلَيْهِمْ وَلَا الضَّالِّينَ

***“Nemət verdiyin kəslərin yoluna! Qəzəbə düçar olmuşların və** (haqdan) **azmışların** (yoluna) **yox!”*** (Fatihə, 1/7)

Göründüyü kimi burada bəhs olunan “nemət verdiyin kəslər”in kimlər olduğu haqda məlumat verilməmişdir. Aşağıdakı ayədə nemət verilənlərin kimlər olduğu açıqlanır.

وَمَنْ يُطِعِ اللّٰهَ وَالرَّسُولَ فَأُولٰئِكَ مَعَ الَّذِينَ أَنْعَمَ اللّٰهُ عَلَيْهِمْ مِنَ النَّبِيِّينَ وَالصِّدِّيقِينَ وَالشُّهَدَاءِ وَالصَّالِحِينَ وَحَسُنَ أُولٰئِكَ رَفِيقًا

***“Allaha və Peyğəmbərə itaət edənlər** (axirətdə) **Allahın nemətlər verdiyi nəbilər** (peyğəmbərlər)**, siddiqlər** (tamamilə doğru danışanlar, etiqadı dürüst, peyğəmbərləri hamıdan əvvəl təsdiq edən şəxslər)**, şəhidlər və salehlərlə** (yaxşı əməl sahibləriylə) **bir yerdə olacaqlar. Onlar necə də gözəl yoldaşlardır!”*** (Nisa, 4/69)

Həmçinin “Ənbiya” surəsində adı verilmədən iffətli və namuslu bir qadından bəhs olunur. Ancaq bu qadının kimliyi həmin ayədə bildirilmir:

وَالَّتِي أَحْصَنَتْ فَرْجَهَا فَنَفَخْنَا فِيهَا مِنْ رُوحِنَا وَجَعَلْنَاهَا وَابْنَهَا آيَةً لِلْعَالَمِينَ

***“**(Ya Rəsulum!) **İsmətini** (bəkarətini) **qoruyanı da** (Məryəmi də yad et)**! Biz Öz ruhumuzdan** (Özümüzün yaratdığımız ruhdan Cəbrail vasitəsilə) **ona üfürdük, onu və oğlunu** (atasız doğulmuş İsanı) **aləmlərə** (mələklərə, bütün insanlara və cinlərə) **bir möcüzə etdik.”*** (Ənbiya, 21/91)

Burada adı verilməyən qadının “Təhrim” surəsində İmranın qızı Məryəm olduğu belə açıqlanır:

وَمَرْيَمَ ابْنَتَ عِمْرَانَ الَّتِي أَحْصَنَتْ فَرْجَهَا فَنَفَخْنَا فِيهِ مِنْ رُوحِنَا وَصَدَّقَتْ بِكَلِمَاتِ رَبِّهَا وَكُتُبِهِ وَكَانَتْ مِنَ الْقَانِتِينَ

***“**(Allah mömin qadınlara) **həmçinin namusunu** (ismətini) **möhkəm qoruyub saxlamış İmranın qızı Məryəmi də misal çəkdi. Biz** (Cəbrail vasitəsilə) **libasının yaxasından ona Öz ruhumuzdan** (Öz yaratdığımız ruhdan) **üfürdük. Məryəm Rəbbinin sözlərini** (şəriətini, dini hökmlərini)**, kitablarını təsdiq etdi və** (Allaha) **itaət edənlərdən oldu.”*** (Təhrim, 66/12)

2. Qurani-Kərim çox istifadə olunmadığına görə mənası asanlıqla bilinməyən elə kəlmələr vardır ki, həmin kəlmələrin mənası başqa ayələrdə açıqlanır. “Məaric” surəsi 19-21-ci ayələrini buna misal vermək olar.

**“**إِنَّ الْإِنْسَانَ خُلِقَ هَلُوعًا / ***Həqiqətən, insan** (sərvətə) **çox haris** (tamahkar və kəmhövsələ) **yaradılmışdır!”*** Burada başa düşülməsi çətin olan kəlmə “هَلُوعًا” kəlməsidir. Bu ayədən sonra gələn 20 və 21-ci ayələr həmin kəlməyə belə açıqlıq gətirir:

وَإِذَا مَسَّهُ الْخَيْرُ مَنُوعًا إِذَا مَسَّهُ الشَّرُّ جَزُوعًا

***“Ona bir pislik üz verdikdə fəryad qoparar. Ona bir xeyir nəsib olduqda isə xəsis olar.”***

## III. QURANIN SÜNNƏ İLƏ TƏFSİRİ

Qurani-Kərimi ən yaxşı anlayan və onu anladan əlbəttə ki, Hz. Muhammədd (s.ə.s.) olmuşdur. Hətta Quranı insanlara açıqlamaq onun vəzifəsi idi. Bu haqda Qurani-Kərimdə buyurulur:

***“Biz onları** (peyğəmbərliklərinin doğru olduğunu sübut edən) **açıq-aşkar möcüzələr və kitablarla göndərdik. Sənə də Quranı nazil etdik ki, insanlara onlara göndəriləni** (hökmləri, halal-haramı) **izah edəsən, bəlkə, onlar da düşünüb dərk edələr!”*** **(Nəhl, 16/44)**

Hz. Muhamməd (s.ə.s.) ona endirilən Quranın hamısını insanlara təbliğ edərək öz vəzifəsini mükəmməl şəkildə yerinə yetirmişdir. Belə ki, o, səhabələr tərəfindən soruşulan sualları cavablandırmış, ayələri oxuyaraq əshabına açıqlamış, əshabına suallar yönəltmiş həmin sualları sonra özü cavablandırmışdır. Peyğəmbərimiz bununla kifayətlənməyərək, Quranı öz həyatında tam tətbiq edərək əshabına və daha sonrakı nəsillərə gözəl nümunə olmuşdur. Necə ki özü belə demişdir. *"Mən gözəl əxlaqı tamamlamaq üzrə göndərildim"*. Onun gözəl əxlaqı da, Quranın, yəni Allahın əxlaqıyla əxlaqlanmasıdır.

Hz. Peyğəmbər (s.ə.s.) Quran ayələrini müxtəlif səbəblərlə təfsir etmişdir. Ən etibarlı və qiymətli təfsir əlbəttə Peyğəmbərimizin təfsiridir. Bunlar hədis külliyatında "Təfsir kitabı" bölmələrində və daha sonra müstəqil kitablarda toplanmışdır. Biz burada Peyğəmbərimizin (s.ə.s.) təfsir etdiyi ayələrdən bir neçəsini aşağıda nümunə olaraq vermək istəyirik:

1. Rəsulullah (s.ə.s.) bəzən bir ayəni başqa bir ayə ilə təfsir edirdi. Belə ki,

الَّذِينَ آمَنُوا وَلَمْ يَلْبِسُوا إِيمَانَهُمْ بِظُلْمٍ أُولَٰئِكَ لَهُمُ الْأَمْنُ وَهُمْ مُهْتَدُونَ

***"İman gətirib imanlarını zülmə qatışdırmayanlar əmin-amanlıqdadırlar. Haqq yola yönəlmişlər də onlardır!"*** (Ənam 6/82) ayəsi endiriləndə müsəlmanlar qorxuya düşdülər və: *"Ey Allahın rəsulu, bizim hansımız nəfsinə zülm etmirki?"* -dedilər. Hz. Peyğəmbər də belə cavab verdi: *"Buradakı zülm sözü sizin bildiyiniz zülm deyildir. Burada Loğmanın (əs) oğluna xitab edərək: "Övladım! Allaha şərik qoşma. Çünki şirk əlbəttə böyük zülmdür", -sözündəki zülm qəsd olunmuşdur."* (Buxari, İman 23; Müslim, iman 197)

2. Qurani-Kərimdə "səlat" (namaz qılmaq, dua etmək), "zəkat", "səvm" (oruc tutmaq), "həcc" və bunun kimi ibadət və müamilat əsaslarını təyin edən kəlmələr qeyd olunur. Bütün bunları lüğət mənalarından yola çıxaraq bir insanın başa düşməsi çətindir. Məsələn, namaz qılmağın əmr olunduğu ayədə namazın necə qılınacağını bildirməmişdir. Bunun üçün namazın necə qılınacağını, zəkatın nə qədər veriləcəyini, orucun nə vaxt tutulub nə vaxt iftar ediləcəyini və həccin necə yerinə yetiriləcəyini ancaq Hz. Peyğəmbərin açıqlamalarıyla bilmək mümkün olmuşdur.

3. Qurani-Kərimdə elə ayələr vardır ki, açıqlanmasına ehtiyac duyulur. Bu kimi ayələri Hz. Peyğəmbər (s.ə.s.) izah etmişdir. Məsələn, aşağıdakı ayələr bunun misallarındandır:

لِلَّذِينَ أَحْسَنُوا الْحُسْنَىٰ وَزِيَادَةٌ

***"Yaxşı işlər görənləri artıqlamasıyla yaxşı işlər gözləyir."*** (Yunus 10/26)

Burada bəhs olunan daha yaxşı işin nə olduğunu Hz. Peyğəmbər (s.ə.s.) belə ifadə edir: *"Cənnətliklər cənnətə girdikdən sonra, şanı uca və mübarək olan Allah belə buyuracaq: "Sizə daha artığını verməyimi istədiyiniz bir şey varmı?" Onlar: "Üzlərimizi ağartmadınmı, bizi cənnətə qoymadınmı, cəhənnəm atəşindən qorumadınmı?" -deyəcəklər. Bunun müqabilində uca Allah hicabı açar. Onlara əziz və cəlil olan Rəblərinə baxmaqdan daha çox sevdikləri bir şey verilmiş olmayacaqdır."* Hz. Peyğəmbər bu açıqlamanı verdikdən sonra yuxarıdakı ayəni oxumuşdur. (Müslim, İman 297, 298)

Həmçinin Peyğəmbərimiz (s.ə.s):

كَلَّا ۖ بَلْ ۜ رَانَ عَلَىٰ قُلُوبِهِمْ مَا كَانُوا يَكْسِبُونَ

***"Xeyr*** (belə deyildir)***! Əslində, onların qəlblərini qazandıqları*** (günahlar) ***qaplamışdır."*** (Mudaffifin, 83/14) ayəsini belə təfsir etmişdir:*"Qul bir günah işlədiyi vaxt qəlbinə qara bir nöqtə düşər.*

*Əgər o günahı tərk edib istiğfar, tövbə edərsə, qəlbi cilalanar. Belə yox, təkrar günah işlərsə, qara nöqtələr artar və nəticədə bütün qəlbini örtər. Bax Uca Allahın: "Xeyr (belə deyildir)! Əslində, onların qəlblərini qazandıqları (günahlar) qaplamışdır.", ayəsindən məqsəd budur."* (Tirmizi, Təfsir 83,3334)

## IV. ƏSHABIN QURANI TƏFSİR ETMƏSİ

Hz. Peyğəmbərimizin (s.ə.s.) vəfatından sonra onun Quranı təbliğ etmə vəzifəsi səhabələrə keçdi. Əshabın Quran yolunda vermiş olduqları xidmət əvəzsizdir. Quranın cəm edilməsi, çoxaldılaraq müxtəlif ölkələrə paylanması, Quranın səhv oxunmasının qarşısnı almaq üçün gördükləri tədbirlər onların Qurana xidmət yolunda göstərdiklər ən böyük işlərdəndir.

Əshabın dilinin ərəbcə olması, ayələrin nazil səbəblərinə şahid olmaları, qaranlıq qalan mövzuları Hz. Peyğəmbərdən soruşub öyrənmə imkanları olması səbəbi ilə Quranı anlamaqda çətinlik çəkmirdilər. Əlbəttə, burada bütün səhabələrin elmlə məşğul olduqlarını demək olmaz. Çünki onların bəziləri ticarətlə məşğul olur, bəziləri sənətkarlıqla və.s. Bununla yanaşı səhabələrin içində özlərini elmə həsr etmiş insanlar da vardı. Hz. Əbu Bəkr (r.ə.), Hz. Ömər (r.ə.), Hz. Osman (r.ə.), Hz. Əli (r.ə.), Abullah b. Abbas (r.ə.), Abdullah b. Məsud (r.ə.), Übey b. Kəb (r.ə.), Zeyd b. Sabit (r.ə.), Abdullah b. Zübeyr (r.ə.) alim səhabələrin ən məşhurlarındandır.

Səhabeyi-kiram ayələri təfsir edərkən əvvəlcə Qurani-Kərimə, sonra Hz. Peyğəmbərin (s.ə.s.) sünnəsinə müraciət edirdilər. Əgər bu iki mənbədən suallarına cavab tapa bilmirdilərsə, öz ictihadları ilə təfsir edirdilər. Öz ictihadları ilə təfsir edərkən din və dil faktoruna əhəmiyyət verirdilər. Quran öz ana dillərində endirildiyi üçün onun ləfz və tərkiblərinin incəliklərini rahat anlaya bilirdilər. Beləliklə, onlar dil təhlilləri ilə ərəb şeirlərindən istifadə edərək Quranı daha sonrakı nəsillərə işıq salaraq şəkildə təfsir etmişlər.

Səhabə təfsirinin ümumi xüsusiyyətlərini belə izah edə bilərik:

- Əshab, Qurani-Kərimi başdan sona qədər ayəbəayə təfsir etməmişdir. Daha çox qərib, mübhəm və mücməl ləfzləri təfsir etmişlər.

- Ayələrin təfsirində səhabə arasında bəzi ixtilaflar olurdu. Ancaq bu ixtilaflar mənalar arasında ziddiyyət yox, zənginlik idi. Yəni, bir ayə bir-birinə tərs düşmədən fərqli mənalarda təfsiri edilirdi. Məsələn, "مُخَلَّدُونَ / müxallədün" (Vaqiə 56/17) kəlməsinə bir səhabə "əbədi qalacaqlar", bir başqa səhabə "onlar heç vaxt yaşlanmayacaq, həmişə gənc qalacaqlar" deyə müxtəlif mənalar vermişdir.

- Səhabə dövründə təfsir qeydə alınmadığına görə, onların Quran haqqındakı təfsirləri şifahi nəql olunurdu.

- Səhabə ayələrin nazil olma səbəblərinə şahid olduqları üçün ayələrin nüzul səbəblərini açıqlayırdılar.

Quranın səhabə təfsirinə aşağıdakı ayəni misal verə bilərik:

أَلَمْ تَرَ إِلَى الَّذِينَ بَدَّلُوا نِعْمَتَ اللّٰهِ كُفْرًا وَأَحَلُّوا قَوْمَهُمْ دَارَ الْبَوَارِ * جَهَنَّمَ يَصْلَوْنَهَا وَبِئْسَ الْقَرَارُ

*"(Ya Rəsulum!)* ***Məgər Allahın nemətini küfrə dəyişənləri*** *(Allaha nankor olan Qüreyş kafirlərini)* ***və ümmətini ölüm yurduna sövq edənləri görmürsənmi? Onlar Cəhənnəmə daxil olacaqlar. Ora necə də pis sığınacaqdır!"*** (İbrahim 14/28-29)

Abdullah b. Abbas bu ayəni belə açıqlamışdır: "Allahın nemətlərinə nankorluq edənlər Qüreyş kafirləridir. Onların nankorluq göstərdikləri nemət də Hz. Muhamməddir (s.ə.s.). Ölüm yurdun-

dan məqsəd də Bədrdir. Çünki onların çoxu həmin günkü müharibədə öldürülmüş və cəhənnəmə göndərilmişdilər.” (Buxari, Məğazi 7)

### V. ELMDƏN İSTİFADƏ EDİLMƏSİ

Qurani-Kərimin bir çox ayələrində insanlar düşünməyə, kainatı dərk etməyə çağrılaraq, qarşılaşdıqları problemləri ağlından istifadə edərək həll etməyə təşviq edilir. Elm ağıl, təcrübə və müşahidə ilə kainatda olan şeyləri açıqlayaraq insanın düşüncəsinə, rifahına və sağlam həyat yaşamasına köməklik göstərir. Elm bütün bunları ağıl sayəsində həyata keçirir. Bir müfəssir də ağlın meyvəsi olan bu elmdən maksimum səviyyədə istifadə etməlidir. Çünki din ilə elm arasında qopmaz bir bağlılıq vardır. Bəzi ayələr vardır ki, tarix, tibb, psixologiya, sosiologiya, biologiya və astronomiya kimi elmlərdən istifadə edilərək təfsir olunması daha düzgündür. Məsələn: Quran qissələrində bəhs olunan qövmlərin yaşayış tərzlərinin bilinməsində onların iqtisadi, siyasi və mədəni vəziyyətlərini öyrənmə baxımından tarix, antropologiya və arxeologiya kimi elmlərdən istifadə edildikdə həmin ayələr daha yaxşı aydın olur. Ancaq bütün bunlarla  birlikdə bunu da qeyd etmək lazımdır ki, bu kimi ayələr etiqad və ibadətlə əlaqədar mövzulardan bəhs etmədiyinə görə, bu ayələrin natamam təfsir olunmalarında  bir müsəlmanın etiqadında və ibadətində bir əskiklik meydana gətirməz.

Elmin köməkliyi ilə təfsir olunan ayələrin Quranda mövcud olması onun hər zaman elmin önündə getməsini təmin edir. Bunun bir çox nümunələri vardır. Məsələn, yerin fırlanması, uşağın ana bətnində keçirdiyi bioloji mərhələlər, kainatın genişlənməsi kimi sonradan kəşf olunan məsələlər Qurani-Kərimdə  qeyd olunmuşdur. Bütün bunlar kəşf olunduqdan sonra görülmüşdür ki,  bunların hamısı Qurani-Kərimdə bildirilmişdir. Beləliklə, həmin ayələr həm daha yaxşı başa düşülmüş, həm də Quranın möcüzəviliyini daha  da möhkəmləndirmişdir.

Bütün bunlar bir daha sübut edir ki, Qurani-Kərim hansısa tarixə məxsus bir kitab yox, qiyamətə qədər daim zamanın önündə gedərək insanların hidayəti üçün rəhbər olacaq ilahi bir kitabdır.

### VI. TARİXİLİK

Quran ayələrinin endiyi zaman məkanı, o dövrün iqtisadi, siyasi, mədəni vəziyyətini bilmədən Quranı təfsir etmək mümkün deyil.

Quran ayələrini tarixi nəzərə alaraq yozumladığımızda daha rahat başa düşərik. Əgər bir hadisənin harada, nə vaxt və kimlər arasında keçdiyini bilməsək, o hadisə haqqında düzgün fikir irəli sürə bilmərik. Hadisənin həqiqətini bilmək üçün o hadisə ilə bağlı düzgün məlamatlara sahib olmaq lazımdır. Bütün bunlara görə İslam alimləri Quranın nazil olduğu dövr və nazil olduğu coğrafiya haqqındakı məlumatlara əhəmiyyət vermişlər. Ayənin Məkkə dövründəmi, yoxsa Mədinə dövründəmi nazil olduğu, nazil olduğu dövrün və məkanın ayələrin məzmununa və üslubuna necə təsir etdiyini öyrənmə baxımından önəmlidir. Müfəsirlər ayələrin hansı hadisə ilə bağlı endirildiyini bildirən rəvayətlərdən isifadə etmişlər. Hz. Əli, Abdullah b. Məsud və Abdullah b. Abbas kimi səhabələr hər bir ayənin nə haqqında, kim haqqında və harada nazil olduğunu bildiklərini söyləmişlər. Bu da Quranın həmin tarix içində ələ alıb təfsir etməyin önəmini göstərmə baxımından əhəmiyyətlidir.

Qurani-Kərimin nazil olduğu dövrün iqisadi, siyasi, sosial vəziyyəti Ərəbistan Yarımadasında yaşayan digər din mənsubları, insanlar arasında hakim olan fikir və düşüncələr, ərəblərin İslamiyyətdən öncəki inancları əlaqəli ayələrin tarixi dövrlə bağlıdır. Bunun üçün Quranın na-

zil olduğu bölgədə yaşayan Yəhudilik, Xristianlıq, Məcusilik, Sabiilik kimi inanclar haqqında məlumatlı olmağımız Quranın nüzul mühitini bilməyimizə köməklik edir.

Quran ayələrinin düzgün başa düşülməsi və ondakı hökmlərin insanlar tərəfindən tətbiqində çətinlik çəkilməməsi üçün ayələrin nazil olma səbəbinə, məkan və zaman amilinə Hz. Aişə (r.ənha) belə diqqət çəkmişdir: "Qurandan ilk nazil olanlar cənnət və cəhənnəmin anladıldığı müfəssəl surələrdir. İnsanlar İslam ətrafında cəmləşməyə başlayanda halal və haram mövzularından bəhs edən surələr endirilmişdir. Əgər başlanğıcda "İçki içməyin", şəklində vəhy endirilsəydi, "Biz əsla içki içməyi tərk etmərik", "zina etməyin" şəklində vəhy ensəydi "Biz əsla zinanı tərk etmərik" deyilərdi.

Qurani-Kərim zamanı və onun şərtlərini diqqətə aldığına görə bir dəfədə yox, hissə-hissə nazil olmuşdur. Bu haqda Allah-Təala belə buyurur: ***"Biz Quranı, insanlara ağır ağır oxuyasan -deyə ayə ayə ayırdıq və onu hissə hissə endirdik".*** (İsra, 17/106)

İlk vəhy gəldiyi vaxt Məkkəlilər bütə sitayiş edir, əxlaq normalarına diqqət etmir, qız uşaqlarını diri-diri torpağa basdırır, güclülər zəifləri əzirdilər. Elə buna görə də ilk enən ayələrin əsasını Allahın birliyi, axirətə iman, ədalət, yaxşılığa təşviq, pis şeylərdən uzaq durmaq kimi əxlaqi keyfiyyətlər təşkil edirdi. Daha sonra Mədinə dövründə endirilən ayələrin əksəriyyəti isə sayları minlərlə olan müsəlmanların meydana gətirdiyi İslam cəmiyyətinin əsasını təşkil edən və onu formalaşdıran hüquqi məsələlərdən bəhs etmişdir.

Bütün bunlar Quranın tarixi hadisələrdən kənarda yorumlana bilməyəcəyinin nümunələridir.

## DÖRDÜNCÜ FƏSİLƏ AİD SUALLAR

**Aşağıdakı suallara izahlı cavablar verin.**

1. *Quranın anlaşılmasında Quranın Quranla təfsir edilməsinin əhəmiyyətini açıqlayın*
2. *Quranın anlaşılmasında Quranın sünnə ilə açıqlanmasının önəmini bir misalla açıqlayın*
3. *Tarixiliyin Quranın anlaşılmasındakı rolunu göstərin*
4. *Səhabə təfsirinin özəlliklərindən bəhs edin.*
5. *Quranı öz bütünü içində anlamaqdan nə başa düşürsünüz?*
6. *Əshabdan dörd məşhur alimin adlarını söyləyin.*

**Aşağıdakı sualların düzgün cavablarını işarələyin.**

***1. Qurani-Kərimin başa düşülməsi üçün əsas qaydalardan biri olmayan hansıdır?***

A) Quranı Quranla təfsir etmək

B) Quranı Sünnə ilə təfsir etmək

C) Tarixilik

D) Elm

E) Keçmiş ilahi kitablardan istifadə etmək

***2. Aşağıdakılardan hansı səhabənin təfsir xüsusiyyətlərindən deyildir?***

A) Səhabə ayələrin nazil olma səbəblərinə şahid olduqları üçün ayələrin nüzul səbəblərini açıqlayırdılar.

B) Ayələrin təfsirində səhabə arasında bəzi ixtilaflar olurdu. Ancaq bu ixtilaflar mənalar arasında ziddiyyət yox, zənginlik idi.

C) Əshab Qurani-Kərimi başdan sona ayə-ayə təfsir etməmişdir. Daha çox qərib, mübhəm və mücməl ləfzləri təfsir etmişlər.

D) Səhabə təfsirləri şifahi nəql olunurdu.

E) Səhabə təfsirləri yazıya alınmışdır.

**Aşağıdakı boşluqları verilən kəlmələrlə doldurun.** (sünnə, Quranı Kərim, ictihad)

Səhabeyi-kiram ayələri təfsir edərkən əvvəlcə ........................, sonra ................................. müraciət edirdilər. Əgər bu iki mənbədən suallarına cavab tapa bilmirdilərsə, öz ................ ilə təfsir edirdilər.



# V FƏSİL
# TƏFSİR TARİXİ

**HAZIRLIQ TAPŞIRIQLARI**

1. Qurani-Kərimin insanlara çatdırılması və açıqlanmasında Peyğəmbərimizin funksiyasını araşdırın.
2. Səhabələrin Quranı anlamasında sonrakı nəsillərə görə üstünlükləri nədir? Araşdırın.
3. Tabiun dövründə təfsir fəaliyyətlərinin genişlənməsində əsas faktorlar nədir? Araşdırın.
4. “Rəvayət” və “Dirayət” təfsirlərinin arasındakı fərqləri söyləyin.
5. Rəvayət təfsirlərindən bəzilərini sadalayın.
6. Dirayət təfsirinin növləri barədə danışın.
7. Azərbaycanda edilən təfsirləri araşdırın.
8. Azərbaycanda edilən Quran tərcümələrinin xüsusiyyətləri haqqında məlumat verin.

# I. TƏFSİR TARİXİ HAQQINDA ÜMUMİ MƏLUMAT

## A. Qurani-Kərim təfsir edilməlidir

Qurani-Kərim Allah-Təalanın insanlara haqq ilə batili bəyan edib onları doğru yola çatdırmaq üçün göndərilmiş ilahi bir kitabdır. Oxunması, anlaşılması, əmrlərinə və qadağalarına riayət olunaraq yaşanılması üçün vəhy edilmişdir. Hz. Peyğəmbərə verilən bu əbədi möcüzə yer üzünə nazil olmasından etibarən qiyamətə qədər bütün insanlığın dünya və axirət xoşbəxtliyini qarşısına məqsəd qoymuşdur. Hamı bilməlidir ki, o, nə qəbiristanlıqda oxunmaq, nə də onunla fala baxmaq üçün endirilmişdir. Bər-bəzəkli örtüklərin içinə qoyulub rəflərin bir küncündə saxlanılaraq toz basmasın deyə arada bir alıb tozunu silərək öpüb təkrar yerinə qoyulması üçün də endirilməmişdir. Hansı dili danışmasından, hansı rəngdə olmasından asılı olmayaraq Quranın hidayətinə möhtac olan hər kəsin onun mənasını öyrənməyə və ondakı mesajları dərk etməyə ehtiyacı vardır. Bu yöndən baxıldıqda Qurani-Kərim yer üzündə nə qədər danışılan və yazılan dil varsa, hamısına tərcümə edilməli və mütləq təfsir olunmalıdır. Bu barədə bir ayədə Allah-Təala belə buyurur:

يَا أَيُّهَا الرَّسُولُ بَلِّغْ مَا أُنزِلَ إِلَيْكَ مِن رَّبِّكَ وَإِن لَّمْ تَفْعَلْ فَمَا بَلَّغْتَ رِسَالَتَهُ وَاللّهُ يَعْصِمُكَ مِنَ النَّاسِ إِنَّ اللّهَ لاَ يَهْدِي الْقَوْمَ الْكَافِرِينَ

***Ya Peyğəmbər! Rəbbin tərəfindən sənə nazil ediləni** (Quranı) **təbliğ et. Əgər** (bunu) **etməsən,** (Allahın) **risalətini** (sənə həvalə etdiyik elçilik, peyğəmbərlik vəzifəsini) **yerinə yetirmiş olmazsan. Allah səni insanlardan qoruyacaq. Həqiqətən, Allah kafir camaatı düz yola yönəltməz!*** (Maidə 5/67)

**DÜŞÜNƏK -MÜZAKİRƏ EDƏK**

Peyğəmbərimiz bir hədisində buyurur:

*“Kim bilməyə-bilməyə Quran haqqında bir şey söyləyərsə, cəhənnəmdəki yerinə hazırlaşsın.”* (Tirmizi, Təfsir, 1; Əhməd b. Hənbəl, “əl-Müsnəd”, I, 269; Təbəri, “Camiul-bəyan”, I, 27.)

Digər bir hədisində də belə buyurur:

*“Kim öz ictihadı ilə Quran haqqında bir şey söyləyərsə, isabət etsə (doğru söyləsə) belə səhv etmiş sayılır.”* (Tirmizi, ət-Təfsir, 1; Təbəri, Camiul-bəyan, I, 27.)

Peyğəmərimiz Quran təfsiri barəsində bu qədər şiddətli fikir bildirməsinə baxmayaraq, nəyə görə səhabələr və digər alimlər Qurani-Kərimi öz fikir və rəylərinə (dirayət) görə təfsir etməyə çalışmışlar?

Fikirlərinizi bildirin.

Başqa bir ayədə də belə buyurulur:

أَنزَلْنَا إِلَيْكَ الذِّكْرَ لِتُبَيِّنَ لِلنَّاسِ مَا نُزِّلَ إِلَيْهِمْ وَلَعَلَّهُمْ... يَتَفَكَّرُونَ

***“Biz onları** (peyğəmbərliklərinin doğru olduğunu sübut edən) **açıq-aşkar möcüzələr və kitablarla göndərdik. Sənə də Quranı nazil etdik ki, insanlara onlara göndəriləni** (hökmləri, halal-haramı) **izah edəsən və bəlkə, onlar da düşünüb dərk edələr!”*** (Ən-Nəhl 16/44)

Bu ayələrdən də anlaşıldığı kimi Qurani-Kərim təfsir edilməlidir. Bu təfsir fəaliyyəti də ilk olaraq Hz. Peyğəmbərlə başlamışdır. O, Quranda təfsirə ehtiyacı olan nəsləri lazım gəldikcə izah etmişdir. Ancaq Hz. Peyğəmbərin vəfat etməsi və İslam dininin geniş bir əraziyə yayılması nəticəsində əvvəllər mövcud olmayan bir çox problem ortaya çıxmış və insanlar mənsub olduqları mədəniyyətlərdən təsirlənərək bəzi fikirlərini Quranla əsaslandırmaq istəmişlər. Bunu görən səhabələr Quranı təfsir etməyə başlamışlar və sonrakı dövrlərdə də bu təfsir fəaliyyətləri genişləndirərək də davam etmişlər.

### 1. Hz. Peyğəmbərin təfsiri

Qurani-Kərim Peyğəmbərimizə endirildiyi üçün onu ən yaxşı və ən doğru şəkildə anlayan odur. Hz. Peyğəmbər enən ayələri müxtəlif vəsilələrlə ehtiyaca görə təfsir edirdi. Verdiyi açıqlamalar Qurani-Kərimin anlaşılması və yaşanılmasına işıq tutmuşdur. Hz. Peyğəmbərin özü canlı Quran kimi əməli mövzuları öz həyatında tətbiq edərək göstərmişdir. Məsələn: Qurani-Kərimdə dəstəmaz fərz buyurulmuş, ancaq necə alınacağını Allah-Təala Peyğəmbərinə həvalə etmişdir. Namaz əmr edilmiş, ancaq vaxtları və rükətləri göstərilməmişdir. Həcc fərz edilmiş, ancaq həccin tətbiqinin necə olacağı bildirilməmişdir. Eyni zamanda zəkat fərz buyurulmuş, ancaq miqdarı açıqlanmamışdır. Bütün bunları Hz. Peyğəmbər şəxsən özü tətbiq edərək əshabına göstərmişdir.

Onun səhabələrə açıqladığı Quran həqiqətləri onları irşad etmək məqsədi güdürdü. Təfsir edərkən hər hansı bir ayəni oxuyaraq təfsir edər və ya səhabələrin verdiyi suallar əsasında ayələri açıqlayardı. Onun etdiyi təfsirlər müxtəlif hədis külliyyatlarının

**ƏZBƏRLƏYİN VƏ MÜZAKİRƏ EDİN**

يَا أَيُّهَا الرَّسُولُ بَلِّغْ مَا أُنزِلَ إِلَيْكَ مِن رَّبِّكَ . وَإِن لَّمْ تَفْعَلْ فَمَا بَلَّغْتَ رِسَالَتَهُ . وَاللَّهُ يَعْصِمُكَ مِنَ النَّاسِ . إِنَّ اللَّهَ لَا يَهْدِي الْقَوْمَ الْكَافِرِينَ

***“Ya Peyğəmbər! Rəbbin tərəfindən Sənə nazil ediləni** (Quranı) **təbliğ et. Əgər** (bunu) **etməsən,** (Allahın) **risalətini** (sənə həvalə etdiyi elçilik, peyğəmbərlik vəzifəsini) **yerinə yetirmiş olmazsan. Allah səni insanlardan qoruyacaq. Həqiqətən, Allah kafir camaatı düz yola yönəltməz!”*** (Maidə, 5/67)

بِالْبَيِّنَاتِ وَالزُّبُرِ. وَأَنزَلْنَا إِلَيْكَ الذِّكْرَ لِتُبَيِّنَ لِلنَّاسِ مَا نُزِّلَ إِلَيْهِمْ وَلَعَلَّهُمْ يَتَفَكَّرُونَ

***“Biz onları** (peyğəmbərliklərinin doğru olduğunu sübut edən) **açıq-aşkar möcüzələr və kitablarla göndərdik. Sənə də Quranı nazil etdik ki, insanlara onlara göndəriləni** (hökmləri, halal-haramı) **izah edəsən və bəlkə, onlar da düşünüb dərk edələr!*** (Nəhl surəsi, 16/44)

وَمَا أَنزَلْنَا عَلَيْكَ الْكِتَابَ إِلَّا لِتُبَيِّنَ لَهُمُ الَّذِي اخْتَلَفُوا فِيهِ وَهُدًى وَرَحْمَةً لِّقَوْمٍ يُؤْمِنُونَ

***“Biz Kitabı** (Quranı) **sənə yalnız** (müşriklərə) **ixtilafda olduqları** (tövhid, qiyamət, qəza-qədər və s. bu kimi) **məsələləri izah etmək və möminlərə bir hidayət və mərhəmət olsun deyə nazil etdik!”*** (Nəhl surəsi, 16/64)

وَمَا أَرْسَلْنَا مِن رَّسُولٍ إِلَّا بِلِسَانِ قَوْمِهِ لِيُبَيِّنَ لَهُمْ. فَيُضِلُّ اللَّهُ مَن يَشَاءُ وَيَهْدِي مَن يَشَاءُ وَهُوَ الْعَزِيزُ الْحَكِيمُ

***“Biz hər bir peyğəmbəri yalnız öz millətinin dilində** (danışan) **göndərdik ki,** (Allahın əmrlərini) **ona izah edə bilsin. Allah istədiyi kimsəni zəlalətə salar** (haqq yoldan sapdırar), **istədiyini də doğru yola yönəldər. O, yenilməz qüvvət sahibi, hikmət sahibidir!”*** (İbrahim surəsi, 14/4)

təfsir bölmələrində, rəvayət təfsirlərində və daha sonra qələmə alınmış müstəqil kitablarda bir araya gətirilmişdir. Peyğəmbərimizin Quran təfsiri müxtəlif formalarda olmuşdur. Bəzən ayəni ayə ilə təfsir etmiş, bəzən qapalı (mübhəm) kəlmələri və ifadələri açıqlamışdır (bəyan).

İndi də Peyğəmbərimizin Quran təfsirindən bəzi örnəklərə nəzər salaq:

1. Rəsulullah (s.ə.s.) bəzən bir ayəni başqa bir ayə ilə təfsir edərdi. Misal:

الَّذِينَ آمَنُوا وَلَمْ يَلْبِسُوا إِيمَانَهُم بِظُلْمٍ أُولَٰئِكَ لَهُمُ الْأَمْنُ وَهُم مُّهْتَدُونَ

***“İman gətirib imanlarını zülmə qatışdırmayanlar əmin-amanlıqdadırlar. Haqq yola yönəlmişlər də onlardır!”*** (Ənam, 6/82) ayəsi endiyi zaman müsəlmanlara çox ağır gəldi və

-Ey Allahın Rəsulu, bizdən hansımız nəfsinə zülm etmir ki? -dedilər. Bunun müqabilində Peyğəmbərimiz belə buyurdu:

*“Burada qəsd edilən sizin zənn etdiyiniz zülm deyildir. Burada Loğman (ə.s) oğluna söylədiyi* ***“Oğlum! Allaha şərik qoşma. Doğrudan da, Allaha şərik qoşmaq böyük zülmdür!”*** (Loğman, 13) *sözündəki zülüm nəzərdə tutulmuşdur.”* (Buxari, İman 23; Müslim, İman 197)

2. Hz. Peyğəmbər bəzi yerlərdə mücməl bir ifadəni təbyin edərdi (açıqlayardı). Bilindiyi kimi mücməl, bir açıqlayıcı tərəfindən açıqlanmadıqca mənası qapalı qalan ləfzlərdir. Misal:

كَلَّا بَلْ رَانَ عَلَىٰ قُلُوبِهِم مَّا كَانُوا يَكْسِبُونَ

***“Xeyr. Onların qəlblərini qazandıqları*** *(günahlar)* ***qaplamışdır.”*** (Mutaffifin, 83/14) Bu ayədə mücməl olan “qəlblərini qazandıqları qaplamışdır” ifadəsini Allah Rəsulu belə təfsir etmişdir:

*“Qul bir günah işlədiyi zaman qəlbinə qara bir nöqtə vurulur. Əgər o günahı tərk edib tövbə edərsə, qəlbi cilalanar. Belə etməyib təkrar günahlara qayıdarsa, qəlbindəki qara nöqtələr artırılar və sonunda bütün qəlbini bürüyər.”* (Tirmizi, Təfsir, 83/3334)

3. Peyğəmbərimiz bəzən ayələrdə anlaşılması çətin olan qapalı (mübhəm) kəlmələri açıqlamışdır:

**DİQQƏT YETİRİN**

Hz. Əli belə demişdir: “Məndən Allahın kitabı haqqında soruşun. Allaha and içirəm ki, Qurani-Kərimdə hər hansı bir ayənin harada və nə haqqında nazil olduğunu, gecə və ya gündüz, dağda yaxud düzənlikdə (ovada) nazil olduğunu bilirəm. Şübhəsiz ki, Rəbbim mənə çox yaxşı anlayan bir qəlb və çox soruşan bir dil ehsan etmişdir.” (Süyuti, İtqan, II, 239; Zəhəbi, ət-Təfsir vəl-Müfəssirun, I, 90.)

Hz. Əli (r.ə) bu sözü ilə səhabə arasında elminin nə qədər yüksək bir zirvədə olduğunu göstərmişdir. Eyni zamanda Hz. Əli əhkam ayələrinin təfsirində, hüquqi mövzularda səhabələr tərəfindən ən çox etibar edilən bir şəxsiyyət olmuşdur. İslam hüququnun incəliklərinə yiyələnən Hz. Ömər də: *“İçimizdə ən isabətli (dəqiq) hökm verən Əlidir”* (Buxari, Təfsir, 2/6) -deyərək onun bu elminə olduqca yüksək qiymət vermişdir.

Hz. Əli və Hz. Ömərin bu sözlərinə görə səhabənin Quran təfsiri haqqında hansı qərara gəlmək olar? Müzakirə edin

حَافِظُوا عَلَى الصَّلَوَاتِ وَالصَّلَاةِ الْوُسْطَىٰ وَقُومُوا لِلَّهِ قَانِتِينَ

***“Namazlara və orta namaza riayət edin və Allaha itaət üçün ayağa qalxın** (namaza durun).”* (Bəqərə, 2/238.) Bu ayədəki “orta namaz” ifadəsindən nəyin qəsd olunduğu aydın deyildir. Yəni, “əs-salət əl-vüsta” (orta namaz) sözü mübhəmdir. Ancaq Hz. Peyğəmbərin *“orta namaz ikindi namazıdır”* hədisi bu mübhəmliyi ortadan qaldırmışdır.

4. Hz. Peyğəmbər bəzi ayələrdəki kəlmələri başqa kəlmələrlə izah etmişdir. Bu üsula da təfsir elmində “Lüğəvi bəyan” deyilir. Misal:

وَتَعَاوَنُوا عَلَى الْبِرِّ وَالتَّقْوَىٰ ۖ وَلَا تَعَاوَنُوا عَلَى الْإِثْمِ وَالْعُدْوَانِ.....

***“...Yaxşılıq etməkdə və pis əməllərdən çəkinməkdə əlbir olun, günah iş görməkdə və düşmənçilik etməkdə bir-birinizə kömək göstərməyin...”*** (Maidə, 2) Bu ayədə və başqa ayələrdə keçən “**الْبِرّ / yaxşılıq**” kəlməsinin mənası soruşulduqda Hz. Peyğəmbər; *“Əlbirru husnul xulqi -yaxşılıq gözəl əxlaqdır”*,- deyə cavab vermişdir. (Tirmizi, Kitabut-Təfsir, 3.)

**YADDA SAXLAYAQ**

Səhabə təfsirinin bəzi xüsusiyyətləri bunlardır:

- Səhabələr Qurani-Kərimi başdan sona qədər ayə-ayə təfsir etməmişlər. Buna ehtiyac da yox idi. Daha çox qərib, mücməl, mübhəm ifadələri açıqlamışlar.
- Səhabələr ayəni ayə ilə, nüzul səbəbləri və Hz. Peyğəmbərdən eşitdikləri açıqlamalarla təfsir etmişlər.
- Bəzən öz aralarında müxtəlif fikirlər ortaya çıxırdı. Bunlarda qətiyyən bir-biri ilə ziddiyyət təşkil etmir, əksinə, məsələnin fərqli tərəflərini ortaya qoyurdu. Məsələn: ***“muxallədun”*** kəlməsini bir səhabə ***“əbədi qalacaqlar”***, başqa bir səhabə isə ***“onlar heç yaşlanmayacaqlar”*** şəklində təfsir etdiyi kimi.
- Əhkam ayələrindən hökm çıxarmamışlar.
- Səhabələrin etdikləri təfsirlər öz yaşadıqları dövrdə tədvin edilməmişdir (yazılmamışdır).

**2. Səhabənin Quran təfsiri**

Qurani-Kərimin təfsir edilərək bu günə gəlib çatmasında səhabə təfsirinin də böyük rolu vardır. Çünki səhabələr ərəb olduqları üçün Ərəb dilinin incəliklərini, Ərəb adət-ənənələrini yaxşı bilirdilər. Eyni zamanda üstün bir idrak gücünə və sağlam bir imana sahib idilər. Bunlardan başqa, ayələrin enişini canlı müşahidə etdikləri və ayələrin enişinə səbəb olan hadisələri bildikləri üçün Qurani-Kərimi anlamaqda çətinlik çəkmirdilər. Ancaq bütün səhabələr bu işdə eyni səviyyədə deyildilər. Zəkaları və elmə yiyələnmələri baxımından digər insanlar kimi onlar da bir-birindən fərqli idilər. Bununla birlikdə bəziləri elmi fəaliyyətlərə böyük vaxt sərf edirdilər, bəziləri isə bu işlə çox az məşğul olurdular. Bu səbəbdən Quranın təfsiri ilə məşğul olanlar müəyyən kimsələrdi. Onlardan təfsirlə əsas məşğul olaraq bu işdə şöhrət sahibi olanlar; Xüləfayi-Raşidin adı verilən 4 böyük səhabə, Abdullah b. Abbas, Abdullah b. Məsud, Übey b. Kab, Zeyd b. Sabit, Abdullah b. Zübeyr, Əbu Musa Əl-Əşəridir (r.ə)

Səhabeyi-kiram ayələri təfsir edərkən əvvəlcə Qurani-Kərimə, sonra Peyğəmbərimizin sünnəsinə (hədislərinə) müraciət edirdilər. Əgər axtardıqları məsələni bunlarda tapa bilməsələr öz rəyləri ilə hərəkət edirdilər. Öz rəy və ictihadları ilə hərəkət edərkən də, əsasən, Ərəb dilinin incəliklərindən, şerlərdən və ya öz dini biliklərindən istifadə edirdilər. Çünki Quran öz ana dillərində nazil olduğu üçün onun ləfzlərini və tərkiblərini Hz. Peyğəmbərdən sonra ən yaxşı onlar bilirdilər.

Səhabələrdən təfsirlə bağlı ən çox rəvayəti bir araya toplayıb bu rəvayətləri nəql edən və Qurandakı qərib, mücməl kəlmələri açıqlayan Abdullah b. Abbas idi. Ona görə ona "Tərcümanül-Quran" adı verilmişdir. Eyni zamanda hədis və fiqh elmində də yüksək zirvəyə çıxan bu mübarək səhabəyə Peğyəmbərimiz *"Allahım, ona kitabı öyrət və onu dində fəqih (mütəxəssis) et"*(Buxari, Elm, 17) şəklində xüsusi dua etmişdir.

Qurani-Kərim və təfsir elmində ən çox biliyə malik olan digər bir səhabə də Abdullah b. Məsuddur. Kufə təfsir məktəbinin də banisi sayılan İbn Məsud mütəşabeh ayələri öz rəyi və ictihadı ilə təvil etmişdir. Onun rəy və ictihadına əsaslanan bu təfsir məktəbi daha sonra Hənəfi məzhəbinin ortaya çıxmasında öz böyük təsirini göstərmişdir. Məsələn: İbn Məsud "Maidə" surəsinin yəmin kəffarəsindən bəhs edən 89-cu ayəsindəki ***"...Bunları etməyə imkanı olmayan şəxs üç gün oruc tutmalıdır..."*** ifadəsinə ***"mütətəbiat"*** yəni, ***"dalbadal"*** sözünü əlavə etmişdir. Buna görə Hənəfi məzhəbində yəmin kəffarəsi üçün oruc tutmalı olan bir kimsə orucunu üç gün dalbadal tutmalıdır.

### 3. Tabiunlar dövründə təfsir

Tabiun dövrü əvvəlki dövrlərə görə təfsirin zirvəyə çıxmağa başladığı dövrdür. İslam coğrafiyasının gün keçdikcə genişlənərək böyüməsi təfsir fəaliyyətlərinə də böyük təsir göstərmişdir. Təfsirin yanında hədis, fiqh, əqaid kimi İslam elmlərinin bir çoxu bu dövrdə sistemləşməyə başlamış və bu elmlər çərçivəsində ciddi çalışmalar aparılmışdır. Tabiunlar səhabələrdən aldıqları dini-elmi miras olan Quran və sünnəni eyni saflığı ilə qoruyub davam etdirmişlər. Səhabə dövründə şifahi davam edən təfsir fəaliyyətləri tabiunlar dövründə də bəzən səhifələrə yazılsa da, əsasən, şifahi davam etmişdir.

Tabiunların Quranı təfsir etmə metodu səhabənin Quran təfsirinə bənzəyirdi. Onlar da səhabələr kimi bir ayəni izah edərkən öncə ayəni ayə ilə, orda tapabilməzlərsə, Hz. Peyğəmbərin hədisləri ilə açıqlamağa çalışmışlar. Bunların yanında səhabələrin görüşlərindən, əsbabi-nüzuldan və Ərəb dilindən də istifadə etmişlər. Bu rəvayətlərin əsasında zaman-zaman öz görüş və rəylərini də açıqlamışlardır. Tabiunların təfsirinin ən mühüm özəlliyi, yəhudi və xristianlardan müsəlman olan kimsələrin əvvəlki inanc və düşüncələrinə aid uydurma fikirlərin, Tövrat və İncildə qeyd edilən peyğəmbərlərin və əvvəlki qövmlərin həyatları ilə əlaqədar rəvayətlərin təfsir elminə girməsidir. Əsasən, səhabə dövrünün sonlarına yaxın təfsir elminə girən və tabiunlar dövründə daha da genişlənən bu rəvayətlərə "İsrailiyyat" deyilir. Ancaq tabiun alimlərinin böyükləri təfsir elminə dair sağlam məlumatları toplayarkən İsrailliyyata da əngəl olmağa çalışmışlar.

Yuxarıda da qeyd etdiyimiz kimi tabiunlar dövründə təfsir fəaliyyətləri xeyli genişlənmişdir. Zaman

**YADDA SAXLAYIN**

Tabiun təfsirinin bəzi xüsusiyyətləri bunlardır:

- Tabiunlar Qurani-Kərimi başdan sona qədər təfsir etmişlər.
- Əhkam ayələrinə geniş izahlar vermişlər.
- Qurani-Kərimdə bəzi ləfzləri izah etmək üçün şerlərdən istifadə etmişlər.
- Tabiunlar qiyas metodundan da istifadə etmişlər.
- Tabiunlar Qurandakı qissələr və bəzi mübhəm ayələrin təfsilatını öyrənmək üçün İsrailiyyat deyilən qeyri-İslami məlumatlardan istifadə etmişlər.

**İNCƏLƏYİN**

Tabiunların təfsirindən iki nümunə:

وَلِلّٰهِ عَلَى النَّاسِ حِجُّ الْبَيْتِ مَنِ اسْتَطَاعَ إِلَيْهِ سَبِيلًا

1- ***"...Onun yoluna gücü çatan hər bir kəsin həccə gedib o evi ziyarət etməsi insanların Allah qarşısında borcudur..."*** (Ali İmran, 67)

Tabiunlardan Səid b. Cübeyr bu ayə haqqında öz görüşünü bu şəkildə bildirmişdir:

"Burada həccə getməyə gücü çatan kimsə, miniyi və gedib gələnə qədər kifayət qədər yeyəcəyi olan kimsədir. Ona görə belə kimsənin həccə getməsi fərzdir". (Təbəri, "Camiül-Bəyan", IV, 16)

قَالَ فَالْحَقُّ وَالْحَقَّ أَقُولُ

2- **"***(Allah)* **buyurdu, Həqiqətən, doğru deyirəm"** ayəsinə tabiun müfəssirlərindən Mücahid b. Cəbr belə məna vermişdir: *"Allah: Mən Allaham və söylədiyim haqdır."* (Təbəri, "Camiul-Bəyan", XXXIII, 187-188)

keçdikcə fəth olunan bölgələrin artması ilə oralarda da elmi fəaliyyətlər canlanmağa başladı. Öncə səhabələrin, sonra da tabiunların bu elmi fəaliyyətləri nəticəsində müxtəlif məktəblər meydana gəldi. Bu məktəblərin müəllimləri səhabələr, tələbələri də tabiunlar idi. Bu məktəblərin bəzilərində daha çox Quranın təfsirinə üstünlük verilməyə başlandı və bunlardan üçü təfsir elmində böyük şöhrət əldə etdi. Sözügedən bu məktəblərə qısa nəzər salaq:

**a. Məkkə məktəbi**

Bu məktəbin banisi Tərcümanül-Quran adı ilə məşhur olan böyük səhabə Abdullah b. Abbasdır (r.ə) İbn Abbasın tələbəsi olub bu məktəbdən yetişən tabiun müfəssirlərindən ən məşhurları bunlardır:

- Mücahid b. Cəbr
- İkrimə
- Səid b. Cübeyr
- Tavus b. Keysan
- Əta b. Əbu Rəbah

**b. Mədinə məktəbi**

Bu məktəbin banisi səhabənin qarilərindən və müfəssirlərindən Übey b. Kəbdir (r.ə). Məşhur tələbələri bunlardır:

- Əbu Aliyə
- Məhəmməd b. Kab əl-Qürəzi
- Zeyd b. Əsləm

**c. İraq (Kufə) məktəbi**

Kufə təfsir məktəbinin banisi məşhur səhabə Abdullah b. Məsuddur (r.ə). Daha çox ağıl və ictihada əhəmiyyət vermişlər. Buna görə İslam alimləri İbn Məsudun qurduğu bu məktəbi ictihadi hərəkətin başlanğıc nöqtəsi hesab etmiş və onu "İraq rəy məktəbi" adlandırmışlar. İbn Məsudun məşhur tələbələri bunlardır:

- Alkamə b. Kays
- Məsruq b. əl-Əcda
- Əsvəd b. Yezid
- Həsən əl-Bəsri
- Qatədə b. Diamə

**B. Təfsirin tədvini (yazılması)**

Tədvin lüğətdə "bir araya gətirmək", "toplamaq", "cəm etmək" mənalarına gəlir. Termin olaraq isə; ilk dövrlərdə nəql edilən şifahi rəvayətləri nizamlı və sistemli bir şəkildə kitablarda

toplamaq mənasını ifadə edir. Təfsirin tədvini isə Qurani-Kərimin təfsiri ilə əlaqədar rəvayətlərin nizamlı və sistemli bir şəkildə kitablarda toplanması başa düşülür.

İlk dövrlərdə təfsir yazıya alınmadan əvvəl şifahi olaraq ağızdan ağıza nəql edilirdi. Peyğəmbərimiz Allah-Təaladan vəhyi qəbul edir və onu səhabələrə şifahi olaraq oxuyurdu. Səhabələr də Peyğəmbərimizdən eşitdikləri ayələri, müşahidə etdikləri hadisələri, digər tərəfdən öz rəy və ictihadlarını yenə eyni şəkildə şifahi olaraq tabiunlara nəql edirdilər. Tabiunlara nəql edilən bu şifahi bilgilər II hicri əsrin yarısında yavaş-yavaş yazılmağa başlanmış, digər İslam elmləri kimi təfsir sahəsində də əsərlər ortaya çıxmağa başlamışdır. Təfsirin yazılmasının bu qədər gecikməsinin əslində bəzi səbəbləri də vardır. Mənbələrin verdiyi məlumatlara görə, Hz. Peyğəmbər ilk dövrdə Quranla qarışma təhlükəsi olmasın deyə, Qurani-Kərimdən başqa bir şeyin yazılmasına icazə verməmişdir. Bir neçə müddətdən sonra səhabələrin elmdə müəyyən bir səviyyəyə çatdığını görən Peyğəmbərimiz artıq elmin yazılmasına razılıq vermişdir. Onlara verilən bu icazədən sonra səhabələr əvvəlcə unudularaq məhv olma təhlükəsi ilə qarşı-qarşıya qalan hədisləri sürətlə yazmağa başladılar. Təbii ki, bu hədislərin bir qismi ayələrin təfsiri ilə əlaqədar olduğuna görə təfsir elmi hədis kitablarının içində “Kitabut-təfsir” bölməsi adı altında yer almağa başladı. Ancaq təfsirlə bağlı bu rəvayətlər Qurani-Kərimin hamısını ehtiva edəcək qədər deyildi. Çünki nə Hz. Peyğəmbər, nə də səhabələr Quranın bütün ayələrini açıqlamışlar. Səhabələr ancaq Qurani-Kərimdən anlamadıqları yerləri Peyğəmbərimizdən soruşmuşlar. O da müəyyən ayələri açıqlamışdır.

**DİQQƏT YETİRİN**

Təfsir tarixində ilk təfsir yazan alimlər və təfsirləri

1. Müqatil b. Süleyman (öl. 150/767), “ət-Təfsirul-kəbir”.

2. Süfyanüs-Sövri (öl. 161/778), Kitabut-Təfsir

3. Yəhya b. Səllam (öl. 200/815), “Təfsiru-Yahya”.

4. Əbu Zəkəriyyə Yəhya b. Ziyad əl-Fərra (öl. 207/822), “Məanil-Quran”

5. Əbu Übeydə Məmər b. əl-Müsənna (öl. 210/825), “Məcazül-Quran”.

6. Əbdürrəzzaq b. Həmmam (öl. 211/827), “Təfsirül-Quran”.

Hədis elminin bir qolu olaraq tədvin edilən təfsir qısa zaman sonra müstəqil bir elm halına gəlməyə başladı. Zaman keçdikcə fəth edilən ölkələrin sayının artması səbəbi ilə İslama yeni daxil olan qeyri-ərəb millətlər Qurani-Kərimi anlaya bilmirdi. Ona görə də digər İslami elmlərdə olduğu kimi təfsir elmində də yeni irəliləyişlər, yeni fikirlər, yeni rəylər ortaya çıxmağa başlamışdı. Bu səbəbdən təfsir elmi də sürətlə inkişaf etdi və bu elmlə bağlı müstəqil əsərlər yazılmağa başlandı. Mənbələrin bildirdiyinə görə, Qurani-Kərimə dair bütün rəvayətləri bir araya toplayaraq onu bir kitab formasında başdan sona qədər təfsir edən ilk şəxs “Müqatil b. Süleyman”dır. Ancaq ilk təfsir kitabını yazanın Əli b. Əbu Təlhə olduğunu söyləyən rəvayətlər də vardır. Ancaq Əli b. Əbu Təlhəyə aid olan təfsir səhifələri qısacası, Quranın bəzi ayələri ilə əlaqədar İbn Abbasdan nəql olunan rəvayətlərdir. Yəni, tam bir təfsir deyildir.

**C. Təfsir növləri**

Müfəssirlər Qurani-Kərimin müxtəlif yönlərini ələ alaraq təfsir etməyə çalışmışlar. Onlardan bəziləri Qurani-Kərimin Allah kəlamı olaraq üstünlüyünü isbat etmək üçün onun bəlağət yönlərinə,




məna və üslubuna diqqəti cəlb etmiş, bəziləri ləfzlərin və ifadələrin mənalarını açıqlamaq üçün qrammatikaya üstünlük vermiş, bir qisim müfəssirlər də əhkam ayələrinin üzərində dayanaraq İslam dininin qayda-qanunlarını açıqlamaq üçün Qurani-Kərimin eyni zamanda bir hüquq kitabı olduğuna diqqət çəkmək istəmişlər. Bunların yanında Qurani-Kərimi öz inanc əsasları daxilində təfsir edərək bağlı olduqları məzhəb və ya qrupun görüşlərini ön plana çıxarmağa çalışan müfəssirlər də olmuşdur. Ancaq təfsirlərdə görülən bu fərqli üslüblarla yanaşı bütün müfəssirlər əvvəlcə Quranı Quranla, Quranı sünnə və səhabə sözləri ilə təfsir etməyə diqqət göstərmişlər. Buna görə təfsirlər nəql, yəni; rəvayət və ictihad (rəy), yəni, dirayət olmaqla iki yerə ayrılır.

**1. Rəvayət təfsiri**

Rəvayət sözü ərəbcə feilin məsdər şəklində olub "anlatmaq, nəql etmək" mənalarına gəlir. Qurani-Kərimə, Peyğəmbərimizin hədislərinə, səhabə və tabiundan nəql edilən rəvayətlərə, ərəb dili və cahiliyyə ərəb şeirlərinə əsaslanaraq edilən təfsirə rəvayət təfsiri deyilir. Buna görə rəvayət təfsirinin qaynaqları Qurani-Kərim, Hz. Peyğəmbərin sünnəsi, səhabə və tabiun sözləri, ərəb dili və cahiliyyə ərəb şeirləridir. Rəvayət təfsirlərinə məsur, mənqul və ya nəqli təfsir adı da verilmişdir. Qurani-Kərimin ilk təfsirləri rəvayət təfsirləri olmuşdur.




Təfsirin rəvayət metodunda bir ayə təfsir edilərkən öncə həmin ayəni açıqlayan mövzu ilə bağlı başqa ayələr nəql edilir. Bunun ardından Peyğəmbərimizin hədislərindən nümunələr verilir, daha sonra yenə mövzu ilə əlaqədar səhabələrin görüşlərinə, tabiunların fikirlərinə və ərəb

şeirlərinə yer verilir. İndi də İslam dünyasında yazılmış məşhur rəvayət təfsirlərindən bəzilərinə yazarları ilə birlikdə nəzər salaq:

1. Məhəmməd b. Cərir ət-Təbəri (ö. 310/922), "Camiül-bəyan ən təvilil-Quran".
2. Əbül-Leys əs-Səmərqəndi (ö. 383/993), "Təfsirül-Quranil-Əzim".
3. Əbu İshaq əs-Sələbi (ö. 427/1036), "əl-Kəşf vəl-bəyan".
4. Əbu Məhəmməd əl-Hüseyn əl-Bəğəvi (ö. 516/1122), "Məalimüt-Tənzil".
5. İbn Kəsir (ö. 774/1372), "Təfsirul-Quranil-əzim".
6. Əbdurrəhman b. Əbu Bəkr b. Məhəmməd əs-Suyuti (ö. 911/1505), "əd-Dürrül-mənsur fit-təfsir bil-məsur".

**2. Dirayət təfsiri**

Dirayət sözü ərəbcə "anlamaq, qavramaq, dərk etmək mənasına gələn bir kəlmədir. Dirayət təfsiri, sadəcə, rəvayətlərlə kifayətlənməyib ərəb dili və ədəbiyyatı, fəlsəfə və müxtəlif elmlərə əsaslanaraq edilən təfsir metodudur. Dirayət təfsirinə "rəy təfsiri" və ya "əqli təfsir" də deyilir.

Dirayət təfsiri ehtiyac nəticəsində ortaya çıxmışdır. Belə ki, İslam coğrafiyası genişləndikcə yeni hadisələrin, fəlsəfi fikirlərin və müxtəlif məzhəblərin ortaya çıxması ilə birlikdə daha əvvəllər açıqlanmayan bəzi ayələrin təfsirinə də ehtiyac duyulmağa başlanmışdı. Belə həssas bir məqamda rəvayət təfsiri ilə yanaşı, izaha ehtiyac hiss olunan ayələrdə şərhlərə, fikir ayrılığına da yer verilməsi qaçılmaz oldu. Bu səbəblərə görə, dirayət təfsiri də Qurani-Kərim elmində öz yerini almış oldu. Dirayət təfsirinin rəvayət təfsirindən əsas fərqi, müfəssirin hər hansı bir məsələdə öz rəyini ortaya qoymasıdır. Ancaq bu, onun rəvayət təfsirindən istifadə etmədiyi mənasına gəlmir. Dirayət təfsirində müfəssirin izlədiyi metod, əvvəlcə təfsir ediləcək ayə ilə bağlı rəvayətlərə yer vermək, ondan sonra lazım gələrsə, həmin ayə ilə əlaqədar öz fikrini bildirməsi ilə gerçəkləşir. Ancaq burada müfəssirin istənilən ayənin təfsiri barədə ortaya qoyduğu fikir o ayə ilə əlaqədar sağlam rəvayətlərə zidd gəlməməlidir.

1. İslam dünyasında məşhur olan bəzi dirayət təfsirləri və müəllifləri bunlardır:

2. Fəxrəddin ər-Razi (ö. 606/1209), "Məfatihul-Qeyb".

3. Ömər b. Məhəmməd əl-Beyzavi (ö. 585/1189), "Ənvarut-tənzil və əsrarüt-təvil".

4. Carullah Mahmud b. Ömər əz-Zəməxşəri (ö. 538/949), "əl-Kəşşaf ən həqaiqit-tənzil".

5. Əbül-Bərəkət Abdullah b. Əhməd b. Mahmud ən-Nəsəfi (öl.710/1310), "Mədarikut-tənzil və həqaiqüt-təvil".



6. Tantavi Cövhəri (ö. 1359/1940) “əl-Cəvahir fi təfsiril-Quran”.
7. əl-Cəssas (ö. 370/980), “Əhkamul-Quran”.

Dirayət təfsiri rəvayət təfsirindən fərqli olaraq bir neçə qismə ayrılır. Bunlar; Filoloji təfsir, Məzhəbi təfsir, İşari (Təsəvvüfi) təfsir, Elmi təfsir, Əhkam təfsiri, İctimai (sosial) təfsirlərdir. İndi növbə bu təfsir növləri ilə yaxından tanış olaq:



**a. Filoloji təfsir**

Fəth olunan bölgələrin müsəlmanların əllərinə keçməsi ilə birlikdə İslam dövlətinin sərhədləri sürətlə genişlənməyə başlamışdı. İslama daxil olan bu bölgələrin ərəb olmayan xalqları Quranı rahat oxuyub anlamaqda çətinlik çəkirdilər. Eyni zamanda bu dövrdə ərəb ədəbiyyatı fars və yunan ədəbiyyatlarının təsiri altında idi. Bütün bunların nəticəsində ərəb dili qrammatikasının qaydaları və Qurani-Kərimin filoloji təhlili məsələsi özünə olan ehtiyacı büruzə verdi. Quranın dil baxımından incələnməsi ilə birlikdə müfəssirlər ərəb cahiliyyə şeirinə də müraciət edərək şeir və bəlağət sənətini inkişaf etdirmişlər. Beləliklə, dirayət metodu ilə edilən ilk təfsir fəaliyyətləri arasında filoloji təfsir də öz yerini almış oldu.

Hicri təqvimi ilə II əsrin ortalarında dil sahəsindəki fəaliyyətlər daha da genişləndi. Ərəb dilinin qrammatik qaydalarını ortaya qoyan və Qurani-Kərimin bu qaydalar əsasında açıqlanmasında misilsiz əməyi olan Xəlil b. Əhməd (ö.170/786), əl-Əxfəş (177/793) və Sibəveyh (180/796) kimi dilçi alimlər olmuşlar. Bu alimlər dil sahəsində yazdıqları möhtəşəm əsərlərlə Qurani-Kərimin dil baxımından təfsir və təhlil edilməsinə böyük töhfə vermişlər.

Qurani-Kərimi filoloji yöndən təfsir edən alimlər, kəlmələrin mənalarını araşdıran kitablara “Məanil-Quran”, anlaşılması çətin olan bəzi qeyri-ərəb mənşəli kəlmələrin mənalarını açıqlayan kitablara “Qəribül-Quran”, eyni səsli və eyni mənalı kəlmələri araşdıran kitablara isə “əl-Vücuh vən-nəzair” adını vermişlər. Qurani-Kərimi dil baxımından təfsir edən alimlərin ən məşhuru əl-Fərradır (ö. 207/822). Onun “Məanil-Quran” adlı kitabı Qurani-Kərimi lüğət yönündən təfsir edən ilk əsərlərdəndir. Həmçinin Əbu Übeydənin (ö. 210/825) “Məcazül-Quran” adlı əsəri, əl-Müsənnanın (210/825) “Məcazül-Quran”ı, İbn Qüteybənin (öl.276/889) “Təvilü-müşkilil-Quran”ı və Zəməxşərinin qısa adı “əl-Kəşşaf” olan təfsiri bu sahədə qələmə alınan ilk və çox mühüm əsərlərdəndir. Rağib əl-İsfəhaninin (ö. 425/1034) “əl-Müfrədat fi Qəribil-Quran” adlı əsəri Qurani-Kərimin kəlmələrinin mənalarını açıqlayan mühüm bir lüğətdir.

**b. Məzhəbi təfsir**

İslamın birinci əsrindən etibarən dini və ya siyasi bir anlayışla ortaya çıxmağa başlayan bəzi məzhəblər təfsirin inkişafını sürətləndirmişlər. Bu məzhəblər mənimsədikləri fikirləri əsaslandırmaq üçün ilk növbədə Qurani-Kərimə müraciət edirdilər. Quranı təfsir edən alimlər mənimsədikləri məzhəblərin din anlayışını təfsirlərində əks etdirmişlər. Bu alimlərin bir hissəsi öz məzhəblərini ön plana çıxarmasa da, digər bir qismi isə, əksinə, təfsirlərində öz məzhəblərinin görüşlərinə daha çox yer vermişlər. Məzhəbi təfsir məktəblərindən bəziləri bunlardır:




***1) Mötəzilə təfsiri***

Mötəzilə Hişam İbni Abdulməlik zamanında yaşayan Vasil İbn Ətanın (ö. 80/131) qurduğu bir məzhəbdir. Bu məzhəb Əməvilər dövründə ortaya çıxsa da, daha çox Abbasilər zamanında İslam zehniyyəti fəaliyyətində öz yerini almışdır.

Mötəzilə məzhəbi Quranı təfsir edərkən hər şeydən əvvəl ağıla böyük üstünlük vermişdir. Əsasən, mütəşabeh ayələri təvil edərkən öz rəylərindən çox istifadə etmişlər. Onlara görə ağıl ilə nəql bir-birinə zidd olarsa, bu zaman ağıl əsas qəbul edilir.

Mötəziləyə görə, Allah bir şeyi bir şeyin səbəbi olaraq yaratmışdır. Kainatda heç bir şey səbəbsiz yaranmamışdır. İnsanın ağlı bu səbəbləri ortaya çıxarmağa və bir şeyin yaxşı (hüsn) və ya pis (qübh) -gözəl və ya çirkin, faydalı və ya zərərli, halal və ya haram olduğunu təyin etməyə qadirdir. Ağlın bu qüdrətinə görə səhih rəvayət ilə sağlam ağıl arasında heç bir ziddiyyət meydana gəlməz. Əgər hər hansı bir ziddiyyət olarsa, onda ağıla üstünlük verilməlidir.

Mötəzilə məzhəbinə görə, Qurandakı bəzi ayələrdə simvolik ifadələr mövcuddur. Bu cür ayələrə həqiqi məna vermək tamamilə yanlışdır. Məsələn:

وَإِذْ أَخَذَ رَبُّكَ مِن بَنِي آدَمَ مِن ظُهُورِهِمْ ذُرِّيَّتَهُمْ وَأَشْهَدَهُمْ عَلَىٰ أَنفُسِهِمْ أَلَسْتُ بِرَبِّكُمْ. قَالُوا بَلَىٰ. شَهِدْنَا. أَن تَقُولُوا يَوْمَ الْقِيَامَةِ إِنَّا كُنَّا عَنْ هَٰذَا غَافِلِينَ.

*"(Ey Peyğəmbərim!)* ***Xatırla ki, bir zaman Rəbbin Adəm oğullarının bellərindən*** *(gələcək)* ***nəsillərini çıxardıb onların özlərinə*** *(bir-birinə)* ***şahid tutaraq: "Mən sizin Rəbbiniz deyiləmmi?" – soruşmuş, onlar da: "Bəli, Rəbbimizsən!" – deyə cavab vermişdilər.*** *(Belə bir şahidliyin səbəbi)* ***qiyamət günü: "Biz bundan qafil idik".*** (Əraf 172) ayəsini simvolik olaraq təfsir etmişlər. Onlara görə, Allah Adəm oğlunun soyunu onların sülbündən çıxararaq onunla danışması tamamilə təmsil və təsvirdən ibarətdir. Burada qəsd olunan Allahın insana rübubiyyətinin və üluhiyyətinin dəlillərini təqdim etməsi və insanların özlərinə nəzarət etmə mexanizmi olan ağlı da bu hadisəyə şahid tutmalarıdır.



Mötəzilə müfəssirləri bəzən ortaya qoyduqları əsaslara zidd olan səhih hədisləri inkar etmiş, xəbəri-vahidə də heç etibar etməmişlər. Ağıla həddindən artıq üstünlük verdikləri üçün Əhli-sünnə alimlərinin qəbul etdiyi həqiqətlərdən bəzilərini inkar və rədd etmişlər. Məsələn; əhli-sünnə alimləri sehri, cinlərin varlığını və Allah dostlarının kəramətlərini qəbul etdiyi halda, Mötəzilə məzhəbi belə şeyləri xurafat hesab etmiş və əşyanın təbiətinə zidd olduğunu iddia etmişlər. Mötəzilə məzhəbinə mənsub bəzi alimlər və əsərləri bunlardır:

1. Əbu Müslim Məhəmməd b. Bəhr əl-İsfəhani (ö. 322/934), "Camiut-təvil li muhkəmit-tənzil".

2. Qazı Əbdülcabbar (ö. 415/1024), "Tənzihül-Quran anil-mətain".

3. Əli b. ət-Tahir əş-Şərif Mürtəza (ö. 436/1044), "Ğürərül-fəvaid və dürərul-qəlaid".

4. Carullah Mahmud b. Ömər əz-Zəməxşəri (ö. 538/949), "əl-Kəşşaf ən həqaiqit-tənzil".

***2) Şiə təfsiri***

Şiəlik Hz. Peyğəmbərin vəfatından sonra Hz. Əli və onun əhli-beytini xəlifəliyə layiq görən və ondan sonrakı xəlifələrin də Hz. Əlinin nəslindən gəlməsi lazım gəldiyinə inanan qrupun adıdır. Bu qrup daha çox "imamət" anlayışı ilə digər məzhəblərdən fərqlənir. Qaliyyə qolu istisna olmaqla digər qollarında imamət məsələsi eynidir. Ancaq şiəliyin ən çox yayğın olan qolu "İmamiyyə Şiəsi" və ya "Cəfəri məzhəbi"dir. Ona görə biz də burada bu məzhəbin təfsir fəaliyyətinin üzərində dayanacağıq:

İmamiyyə şiəsinin təfsir anlayışına keçmədən əvvəl bu məzhəbin inanc əsaslarına nəzər salmaq lazımdır. İmamiyyə şiəsinin inanc əsasları: İmamət, İsmət, Mehdilik, Ricət və Təqiyyədir.

1. İmamət: imam dini və dünyəvi liderdir. Şəriətin qorunması məsələsində Hz. Peyğəmbərin vəkilidir.

2. İsmət: imam Hz. Peyğəmbər kimi zahirdə və batində doğumundan vəfatına qədər bütün ömrü boyu hər cür pis şeylərdən uzaqdır.

3. Mehdilik: yer üzərində zülm və ədalətsizlik hakim olduqdan sonra Mehdi zühur edəcək və dünyaya ədalət gətirəcəkdir.

4. Ricət: gözlənən imam gəldikdən sonra Allah-Təala ölənlərin bir hissəsini öldükləri şəkildə yenidən dirildəcək, onların bəzilərini yüksəldəcək, bəzilərini isə alçaldacaqdır. Kimin haqlı kimin də haqsız olduğunu ortaya çıxaracaqdır.

5. Təqiyyə: cəmiyyətdən və ya hər hansı bir fərddən müxtəlif şəkillərdə qorunmaq, mənsub olduğu məzhəbi, o məzhəbin malını, öz canını və inancını gələcək zərər və ziyanlardan mühafizə etməkdir.

İmamiyyə şiəsi Qurani-Kərimin həqiqi təfsirini yalnız imamların bildiyini və onlardan gələn təfsir rəvayətlərinin məqbul sayıldığını iddia edirlər. Çünki onlara görə bütün peyğəmbərlərin elmi Hz. Əlidə və ondan sonra gələn imamlarda toplanmışdır.

İmamiyyə şiəsi batini təvillərə həddindən artıq əhəmiyyət vermiş və Qurandankı bəzi kəlmə və ifadələrin gizli mənalar ifadə edən simvollar olduğunu söyləmişlər. Onlara görə, Qurani-Kərimin həm zahiri, həm də batini mənaları vardır. Əsas qəsd edilən məna batini mənadır. Uca Allah Quranın zahirini, tövhid, nübüvvət və risalətə çağırmağa; batinini isə imamət, vəlayət və bunlara bağlı olan şeylərə xas etmişdir.

Şiəyə görə, Quranın hər dövrə məxsus mənaları vardır. Zamanın dəyişməsi ilə bu mənalar da dəyişə bilər. Quranın bütün mənalarını yalnız Əhli-beytdən olanlar bilə bilər. Çünki Quran onların evinə enmişdir. Başqaları Quranın batinini deyil, zahirini belə tam bilə bilməzlər.

İmamiyyə şiəsi Qurani-Kərimin ayələrinin bir hissəsini Əhli-sünnədən fərqli təfsir etmişlər. Bunları bir neçə nümunə gətirməklə qısa şəkildə izah edək:

“Maidə” surəsinin dəstəmazla bağlı 6-cı ayəsindəki وَامْسَحُوا بِرُءُوسِكُمْ... وَأَرْجُلَكُمْ إِلَى الْكَعْبَيْنِ... ifadəsinin çılpaq ayağın üzərinə məsh çəkmək olduğunu qəbul etmişlər.

Bu məzhəb imamları ...فَمَا اسْتَمْتَعْتُم بِهِ مِنْهُنَّ فَآتُوهُنَّ أُجُورَهُنَّ فَرِيضَةً... ***“...İstifadə** (mütə) **etdiyiniz qadınların mehrlərini lazımi qaydada verin!...”*** (Nisa, 4/24) ayəsini siğənin dəlili saymışlar və siğəyə aid Hz. Peyğəmbərin hədislərini də inkar etmişlər. Onlara görə siğə imanın şərtlərindəndir. Ömründə bir dəfə siğə etməyənin imanı kamil sayılmaz.

Cəfəri məzhəbi kəlam mövzusunda Mötəzilə məzhəbinə yaxın mövqe tutmuşdur. Bu məzhəb alimləri لَا تُدْرِكُهُ الْأَبْصَارُ وَهُوَ يُدْرِكُ الْأَبْصَارَ... “Gözlər onu dərk etməz, o gözləri dərk edər” (Ənam, 6/103) ayəsini əsas alaraq “ruyətullah” (Allahın görülməsi) məsələsini qəbul etməmişlər.

Bütün bunlardan başqa, İmamiyyə şiəsi peyğəmbərlərin miras qoyduqlarını, faizin qadağan edildiyini, ancaq bəzi durumlarda halal olduğunu bildirmişlər.

Bu məzhəb Qurani-Kərimin təfsirinə dair verdikləri əsərlər baxımından çox zəngindir. Bunlardan bəziləri aşağıdakılardır:

1. Əli b. İmrahim əl-Qummi (ö. hicri III və ya IV əsr), “Təfsuril-Kummi”.
2. Əbu Cəfər Məhəmməd b. əl-Həsən ət-Tusi (ö. 460/1068), “ət-Tibyan”.
3. Əbu Əli əl-Fəzl b. əl-Həsən ət-Tabərsi (ö. 548/ 1153), “Məcməul-bəyan fi təfsirul-Quran”.
4. Sultan Məhəmməd b. Həcər əl-Bəcəhti (hicri XIV), “Bəyanüs-səadə fi məqamətil-ibadə”.
5. Məhəmməd Hüseyn ət-Təbatəbai, “əl-Mizan fi təfsiril-Quran”.

***3) Xarici təfsiri***

Xaricilik də şiəlik kimi Hz. Əli dövründə bir məzhəb olaraq ortaya çıxmış dini-siyasi təriqətlərdən biridir. Sonradan Xaricilər adlanan bu təriqət əvvəlcə Hz. Əliyə yardım etmiş, ancaq

“həkəm” hadisəsində Hz. Əlinin Əbu Musa əl-Əşarini hakim təyin etdiyi üçün küfrə girdiyinə inanaraq ona müxalifət etməyə başlamışlar. Xaricilər Qurani-Kərimin ləfzini əsas götürərək ifadələrdəki əsas mənanı nəzərə almamış və zahiri mənaya görə hərəkət etmişlər. Qurani-Kərimin həm zahiri, həm də batini mənalarının olduğunu söyləyən İmamiyyə şiəsindən də fərqli düşünərək onlara müxalifət etmişlər.

Xaricilərə görə, iman və İslam bir bütün, əməl də imandan bir cüzdür. Bundan dolayı əməli tərk edən imandan çıxmış sayılır. Allahın sifətləri və Quranın məxluq olması məsələsində Mötəzilə kimi düşünən bu sapıq firqə mənsubları böyük günah işləyən kimsələrin həmişəlik cəhənnəmdə qalacağına inanırlar.

Bu məzhəbin mənsublarının əksəriyyəti mədəni yaşayışdan olduqca kənar insanlardan meydana gəldiyinə görə, düşüncə səviyyələri təfsir kitabları yazmağa kifayət etməmişdir. Ona görə bu məzhəbin mənsublarının yazdıqları təfsirlər olduqca azdır. Məhəmməd b. Yusuf İtfiyyiş (ö. 1332/1914) adlı müfəssirin *“Himyanuz-zad ilə daril-məad”* adlı 13 cilddən ibarət olan təfsiri Xaricilərin ən önəmli təfsiridir. Bu təfsir 1300-1314-cü illərdə Zəngibarda çap edilmişdir.

### c. İşari (Təsəvvüfi) təfsir

İşari təfsir Qurani-Kərimin ayələrinin işarə etdiyi dərin və gizli mənaları təsəvvüf əhli tərəfindən açıqlamaq deməkdir. Təsəvvüf qəlbi mənfi duyğulardan təmizləyib dünyəvi arzu və məşğuliyyətlərdən kənarlaşdırma və qəlbə Allah sevgisini yerləşdirmə yoludur.

Təsəvvüfün kökü Hz. Peyğəmbər və səhabələrə qədər uzanır. Hz. Peyğəmbərdən sonra bir çox səhabə və tabiun dünyadan üz çevirib zöhd və təqvaya yönələrək özlərini bu sahədə inkişaf etdirmişlər. Daha sonralar bu fəaliyyətlər getdikcə genişləndi və müəyyən zaman keçdikdən sonra bəzi mütəsəvviflər Qurani-Kərimin batini yönlərini üzə çıxararaq təfsir etməyə başladılar. Bu sahə ilə məşğul olan təsəvvüfçülər Qurani-Kərimin təfsirində onun kəlmə və cümlələrindəki dərin mənaya dalaraq böyük hikmətlər əldə etməyə çalışmışlar. Nəticə etibari ilə digər təfsir məktəbləri yanında işari təfsir məktəbi də ortaya çıxmış oldu. Burada qeyd etmək lazımdır ki, bu fəaliyyət də ölçüsüz, qaydasız deyildir. Əhli-sünnə alimləri də Qurani-Kərimdə zahiri məna ilə birlikdə batini mənanın da olduğunu qəbul etmişlər. Məhz Qurani-Kərimdə buna dəlalət edən bir çox ayələr də vardır:





فَمَالِ هَٰؤُلَاءِ الْقَوْمِ لَا يَكَادُونَ يَفْقَهُونَ حَدِيثًا

***"... Bu camaata nə olub ki, az qala söz də anlamır!"*** (Nisa, 78) və

وَأَسْبَغَ عَلَيْكُمْ نِعَمَهُ ظَاهِرَةً وَبَاطِنَةً

***"... Allah sizə zahir və batin nemətlərini bol miqdarda ehsan etdi."*** (Loğman, 20) ayələri belə ayələrdəndir.

Hz. Peyğəmbər də hədislərində batini mənanı nəzərdə tutaraq işari təfsirin mümkün olduğunu vurğulamışdır. *"Əgər siz mənim bildiklərimi bilsəydiniz az gülər çox ağlayardınız"*. (Buxari, Küsuf, 2; ən-Nikah,107; ər-Riqaq, 28; Müslim, əl-Küsuf, 1; ən-Nəsai, əl-Küsuf, 11.) Başqa bir hədisində də *"Elmlər içərisində gizli inci kimi bir elm vardır ki, onu Allahı tanıyanlardan başqası bilə bilməz"* (əl-Kəlabazi, ət-Taaruf, Qahirə, 1325, səh. 59). Həmçinin digər bir hədisi-şərifində Allah Rəsulu belə buyurur: *"Elm ikidir. Biri qəlbdə gizlidir ki, faydalı olan da budur"*. (Əbu Talib əl-Məkki, "Qutül-Qülub", Misir, 1387/1967, I, 244-245) Bu ayə və hədisi-şəriflərdən də aydın olur ki, şərtlərinə uyğun olan batini təvillər hər zaman mümkün və caizdir. Ancaq alimlər ayələrə işari mənalar verilərkən aşağıdakı maddələrə diqqət edilməli olduğunu bildimişlər:

- İşari məna zahiri məna ilə ziddiyyət təşkil etməməlidir.
- Verilən işari məna kitab və sünnəyə tərs düşməməlidir.
- İşari məna üçün ləfzlərin siyaq və sibaqının uyğun olması (yəni, işari məna verilərkən kəlmənin əvvəli ilə sonrasındakı ifadələr bir-birinə uyğun olmalıdır.)

Mənbələrin bildirdiyinə görə, işari təfsirin sistemləşməyə başladığı dövrlərdə Həsən əl-Bəsri (ö. 110/728), Cəfər əs-Sadiq (öl.148/765), Abdullah b. Mübarək (öl.181/797) bu sahədə önə çıxan təsəvvüfçülərdən sayılır. İşari təfsirin tam sistemləşdiyi tabiun və təbəi-tabiun dövrlərində Səhl b. Adbullah ət-Tüstəri (öl.283/896), Cüneydi-Bağdadi (öl.298/910) və Məhəmməd b. Musa əl-Vasiti (öl.331/942) bu yöndə böyük addımlar atan alimlərdəndir.

Hicri təqviminin IV əsrin sonlarında isə Əbu Abdurrahman əs-Süləmi (öl.412/1021) özündən əvvəlki təsəvvüfçülərin Qurani-Kərimin batini yönləri ilə bağlı qələmə aldıqları təfsir və təvilləri bir araya gətirərək “Həqaiqut-təfsir” adıyla işari təfsirə aid möhtəşəm bir əsər meydana gətirmişdir.

İşari təfsirin inkişafında böyük rolu olan alimlərdən biri də İslam dünyasının ən görkəmli şəxsiyyətlərindən sayılan İmam Qəzalidir. (ö. 505/1111). “İhyaü-ülumid-din” və “Cəvahirul-Quran” adlı əsərləri ilə İmam Qəzali Quran ayələrinin batini mənaları üzərində geniş geniş dayanmışdır.

Qurani-Kərimin işari mənaları ilə dərindən məşğul olaraq bu sahədə özünə məxsus şöhrəti ilə tanınan digər bir təsəvvüfçü alim də Mühyiddin İbn Ərəbidir (ö. 628/1240). İbni Ərəbi Quranın batini mənaları üzərindəki düşüncələri ilə olduqca irəli gedərək “Vəhdəti-vücud” anlayışı ilə bu anlayışı zirvə nöqtəsinə çatdırmışdır.

**d. Elmi təfsir**

Qurani-Kərim insanın yaradıcısı ilə arasında olan münasibətlərlə əlaqədar geniş açıqlamalar verərək, onun kainat və əşya ilə olan münasibətləri üçün ümumi prinsiplər gətirmişdir. Ancaq o. həm ortaya qoyduğu bu ümumi prinsiplərin və elmi həqiqətlərin, həm də əşyanın mahiyyət və qanunlarının araşdırılmasını insanın öz ağlına və iradəsinə həvalə etmişdir. Beləliklə, Quran insana öz ağlından elm yolunda istifadə etməyi tövsiyə etmiş, hətta ona aləmlərin ən üstün varlığı olduğunu tanıma fürsəti vermişdir. Bu ali məqsədi həyata keçirərkən insanların bu məsələlərə diqqətlərini çəkmək və möminlərin imanlarını qüvvətləndirmək məqsədi ilə zaman-zaman müxtəlif elm və fənlərə öz kitabında işarələr etmişdir. Qurani-Kərimdəki bu elm və fənləri araşdıran elm sahəsinə “Elmi təfsir” deyilir.

Mənbələrin bildirdiyinə görə, elmi təfsir Abbasilər dövründə dirayət təfsirinin meydana gəlməsi ilə birlikdə ortaya çıxmağa başlamışdır. Həmin dövrdə müxtəlif dillərdən ərəb dilinə tərcümə fəaliyyətləri inkişaf etməyə başlamış və İslam alimləri fəlsəfə, tibb, riyaziyyat, astronomiya, kimya, fizika kimi çeşidli dünyəvi elm sahələrinə yönəlmişlər. Bütün bunlar da təfsir elmi ilə məşğul olan alimləri Qurani-Kərimdəki kövni ayələri araşdırmağa və bu sahələrdə təfsirlər qələmə almağa vadar etmişdir. Elmi təfsir sahəsində ilk dəfə sistemli və nizamlı bir əsər meydana gətirən İmam Qəzali olmuşdur. Onun bu möhtəşəm təfsirinin adı “Cəvahirul-Quran”dır. Elmi təfsir anlayışının ən güclü müdafiəçilərindən birisi də Fəxrəddin ər-Razidir. Ondan sonra Məhəmməd əl-Mürsi və İmam Süyuti də bu təfsir sahəsinə töhfə verən alimlərdəndir. Elmi təfsirin bu qədər inkişaf etməsinə baxmayaraq, daha sonrakı dövrlərdə bu sahə zaman-zaman diqqətdən kənarda qalmışdır. Ancaq XX əsrdə Misirli alim Tantavi Cövhəri (öl.1359/1940) bu elmdə olduqca zirvələşmiş və “əl-Cəvahir fi təfsiril-Quran” adlı 25 cilddən ibarət möhtəşəm təfsir meydana gətirmişdir. O, bu əsəri ilə elmi təfsir sahəsində özündən əvvəlki və sonraki təfsirlərə nümunə təşkil etmiş və elmi təfsirin inkişafına böyük dəstək vermişdir.

Elmi təfsirin bu qədər yayılmasına baxmayaraq buna qarşı çıxan alimlər də olmuşdur. Elmi təfsiri müdafiə edən alimlər özlərinə Qurani-Kərimdən bəzi dəlillər gətirmişlər. Allah-Təala “Ənam” surəsində belə buyurmuşdur:

...مَا فَرَّطْنَا فِي الْكِتَابِ مِن شَيْءٍ...

***“...Biz Kitabda** (Quranda) **heç bir şeyi nəzərdən qaçırmadıq** (əskiltmədik)**...”*** (Ənam 6/38)

Başqa bir ayədə də:



وَنَزَّلْنَا عَلَيْكَ الْكِتَابَ تِبْيَانًا لِّكُلِّ شَيْءٍ وَهُدًى وَرَحْمَةً وَبُشْرَىٰ لِلْمُسْلِمِينَ...

***"...Biz Quranı sənə hər şeyi izah etmək üçün, müsəlmanlara da bir hidayət, mərhəmət və müjdə olaraq nazil etdik!"*** (Nəhl 16/89) buyurulmuşdur.

Bu təfsir elminə qarşı çıxanların fikrincə, Qurani-Kərimdə fizika, kimya, astronomiya, tibb kimi dünyəvi elmlərə dəlil axtarmaq doğru deyildir. Ancaq Qurani-Kərimi endirildiyi dövrə məxsus etmək və onda heç bir yenilik, kəşflər axtarmamaq da yanlış fikirdir. Çünki Quran bütün dövrlərə xitab edən ilahi və ensiklopedik bir kitabdır. Ona görə də onu təfsir etməyə çalışan hər bir müfəssir yaşadığı dövrə görə hərəkət edərək fikirlərini bu yöndə inkişaf etdirməlidir.

**e. Əhkam təfsiri**

Qurani-Kərimdə ibadət, müamilələr və cəzalarla bağlı ayələrin izahları ilə məşğul olan və bu ayələrdən hökmlər çıxarmağa çalışan təfsir növünə "Əhkam təfsiri" deyilir. Əhkam təfsirinin məqsədi İslamın əsas qaynağı olan Quranın ehtiva etdiyi hökmləri, qayda və prinsipləri ortaya çıxarıb insanlara dünya və axirət xoşbəxtliyinin yollarını göstərməkdir. Bu təfsir sayəsində İslam alimləri əhkam ayələrinin ehtiva etdiyi hökmlərə və fəqihlərin bu ayələrdən çıxardıqları fərqli nəticələrə işarə etmişlər.

Qurani-Kərimdə əhkam ayələrinin sayı barəsində İslam alimləri müxtəlif fikirlər bildirmişlər. İmam Qəzali və Fəxrəddin Razi kimi alimlər bu cür ayələrin sayının 500 olduğunu söyləyərkən bəzi müfəssirlər isə bu rəqəmi 800-ə qədər yüksəltmişlər. Bir qisim alimlər isə bu ayələrin sayını 200-ə endirmişlər. Əhkam ayələrinin sayının müxtəlif olması, bəzi ayələrdə hökmlərin açıq şəkildə ifadə edilməsi, bəzi ayələrdə də Allah-Təalanın hökmlərini müxtəlif formalarda bildirmiş olmasından irəli gəlir. Ona görə Quranda əhkam ayələrini iki yerə ayırmaq lazımdır:

1. İçərisində hökmlərin açıq şəkildə ifadə edildiyi ayələr. "əl-Bəqərə", "ən-Nisa", "əl-Maidə", "əl-Ənam" surələrində belə ayələrin sayı olduqca çoxdur.
2. Birbaşa hökm ifadə etməyən, ancaq istinbat (hökm çıxarma) yolu ilə hökm çıxarılan ayələr.

Peyğəmbərimiz həyatda ikən müsəlmanlar hər mövzuda olduğu kimi əhkam ayələri mövzusunda da anlaya bilmədikləri məsələləri ondan soruşurdular. Ancaq Hz. Peyğəmbərin vəfatından sonra meydana gələn yeni hadisələr qarşısında səhabələr öz ictihadlarına görə hərəkət edirdilər. Tabiun dövründə daha da inkişaf edən əhkam ayələrinin təfsir edilməsi məsələsi hicri II əsrdə olduqca genişlənmişdir. Beləliklə, yavaş-yavaş məzhəblər meydana gəlməyə başladı və ardınca da Əhkamul-Quran, Fiqhul-Quran adıyla əsərlər yazıldı. Bunların bəzilərini aşağıda belə sadalamaq olar:

1. əş-Şafei (ö. 204/819), "Əhkamül-Quran"
2. ət-Təhavi (öl.321/933), "Əhkamül-Quran"
3. əl-Cəssas (ö. 370/980), "Əhkamül-Quran"
4. Əbu Bəkr ibn Ərəbi (ö. 543/1148), "Əhkamul-Quran"
5. əl-Qurtubi (ö. 671/1272), "əl-Cami li-əhkamil-Quran"

**f. İctimai (sosial) təfsir**



İctimai təfsir insanoğlunun sosial problemlərini tədqiq edən və Qurani-Kərimi müasir düşüncə tərzinə uyğun şəkildə ortaya qoymağı hədəfləyən bir təfsir metodudur. Bu metodun ən mühüm xüsusiyyəti təfsiri quruluq və donuqluqdan xilas etməkdir. Məhz buna görə bu təfsir metodunu müdafiə edən İslam alimləri Quranı şərh edərkən, əsasən, onun hidayət yönünü ələ almışlar. İctimai təfsir deyildiyi zaman ilk ağıla gələn şübhəsiz ki, XIX əsrin yetişdirdiyi Misirli alim Məhəmməd Əbdühdur. Əbdüh Misirin İslam dünyasında məşhur olan əl-Əzhər universitetindəki müəllimliyi ərəfəsində təfsirdə özünə məxsus yeni bir metodu mənimsəyərək təfsir dərsləri verirdi. İctimai təfsir də onun verdiyi bu dərslərin nəticəsində yaranmış oldu. Məhəmməd Əbdüh Qurani-Kərimi təfsir edərkən əvvəlki təfsir kitablarına müraciət etmədən və heç bir müfəssirin fikirlərindən təsirlənmədən tamamilə öz düşüncəsini ortaya qoyaraq ayələri təfsir edirdi. Əbdüh və ondan sonra gələn İctimai təfsir metodunu mənimsəyən alimlər ağıla çox üstünlük vermiş və özlərindən əvvəlki alimlərin təfsirlərində qeyd etdikləri bəzi zəif və uydurma məlumatları qətiyyən təfsirlərinə yazmamışlar. Ancaq bunu edərkən zaman-zaman ağıla həddindən artıq üstünlük vermiş və yeri gəldiyində əhli-sünnət alimləri tərəfindən səhih qəbul edilən bəzi rəvayətləri dəlil hesab etməmişlər.

İslam dünyasında məşhur olan bəzi İctimai təfsirin təmsilçilərini və əsərlərini bu şəkildə sıralamaq mümkündür:

1. Məhəmməd Əbdüh (ö. 1323/1905), "Təfsiru-cüzi-əmmə".
2. Rəşid Rıza (ö. 1354/1935), "Təfsirül-Quranil-həkim".
3. əl-Marağİ (ö. 1364/1945), "Təfsirul-Marağİ".
4. Seyyid Qütb (ö. 1906/1966), "Fi Zilalil-Quran".

**D. Əsas təfsir mənbələri**

Təfsir tarixi bölməsinin sonunda bütün dünyada çox məşhur olan təfsir alimləri və yazdıqları əsərlərindən qısa şəkildə bəhs etmək məqsədə uyğundur. Çünki onların təfsir sahəsində qələmə aldıqları əsərlər əsrlər boyu bütün müsəlmanların Quranı anlamaq üçün müraciət etdikləri mühüm mənbələr halına gəlmişdir.

Məlum olduğu kimi Qurani-Kərim ərəb dilində endirilən bir kitab olduğuna görə onun təfsiri ilə bağlı ilk yazılan əsərlər də ərəb dilindədir. Təfsir sahəsində çoxlu sayda əsər yazılmasına baxmayaraq, bunların içərisində bəziləri müxtəlif xüsusiyyətləri baxımından dini elmlərdə mənbə sayılan yüksək səviyyəli təfsirlərdir. Təfsirlərdən bəziləri rəvayət, bəziləri də dirayət yönümlüdür. Biz burada öncə rəvayət, sonra da dirayət təfsirlərindən bəzilərinə nəzər yetirəcəyik:

**Təbəri təfsiri:** *"Camiul-Bəyan ən təvili ayil-Quran"* adlanan bu təfsirin müəllifi İmam Təbəri təfsir tarixində önəmli müfəssirlərdən biridir. Çünki o, öz zamanına qədər gələn dağınıq rəvayətləri təfsirində cəm edərək bu rəvayətlərin bizə qədər gəlib çatmasında mühüm rol oynamışdır. Yazdığı təfsir rəvayət təfsirlərinin şahıdır. Quranın açıqlanmasına dair ensiklopediya mahiyyətində olan bu iri həcmli əsərinə "Camiül-bəyan" adını məhz elə ona görə vermişdir. Bu möhtəşəm əsər 30 cild olaraq çap edilmişdir.

Təbəri təfsirində açıqlamaq istədiyi ayənin öncə qısa izahını verir, sonra isə həmin ayə ilə əlaqədar hədisləri, səhabə və tabiundan gələn xəbərləri nəql edir. Sonunda da bütün bu rəvayətlərdən əldə etdiyi məlumatların qısa xülasəsini verir. Əgər hər hansı bir ayə ilə əlaqədar sözügedən mənbələrdən bir məlumat əldə edə bilməmişsə, Ərəb dilindən istifadə edərək ayələri açıqlamağa çalışmışdır. Ayrıca şeirlərdən, qiraət fərqliliklərindən, fiqhdən, tarixdən və əqidə ilə bağlı görüşlərdən də xeyli istifadə etmişdir. Əsərində çoxlu rəvayət olsa da, zaman-zaman İslamın və Quranın ruhuna zidd gördüyü rəvayətləri tənqid etməyə çalışmışdır. Bu yönlərinə görə Təbərinin təfsiri rəvayət təfsirlərindən sayılsa da dirayət təfsirlərinin xüsusiyyətini də özündə daşıyır. Bəzən ayələrin izahında öz görüşlərinə yer versə də, ümumiyyətlə, bu metoddan qəti şəkildə qaçınmış və belə hərəkət edənləri də tənqid etmişdir.

**İbn Kəsirin təfsiri:** Təbərinin "Camiül-bəyan" adlı təfsirindən sonra, şübhəsiz ki, rəvayət təfsirinin əsas mənbələrindən biri də "Təfsirül-Quranil-Əzim"dir. İbn Kəsirin qələmə aldığı bu misilsiz əsər, əsrlər boyu İslam dünyasında dini sahədə araşdırma aparan mütəxəssislərin müraciət etdiyi önəmli mənbələrdən biri olmuşdur. İbn Kəsir də Təbəri kimi Quranı təfsir edərkən onun rəvayət yönünə üstünlük vermişdir. Yəni Quranı Quran, hədis, səhabə sözləri və tabiunun görüşləri ilə təfsir etməyə çalışmışdır. Təfsirdə hədislərə rəvayət zənciri ilə birlikdə geniş yer verilmiş, zaman-zaman müəllif onların sənədlərini incələyərək səhihlərini zəiflərindən ayırd etməyə çalışmışdır. Bundan əlavə, İsrailiyyatdan gələn rəvayətlərə də zaman-zaman diqqətli bir şəkildə təmas etmiş və hətta yeri gəldikcə tənqid etmişdir. İbn Kəsir dil və bəlağət mövzularına, hökmlərlə əlaqədar məsələlərə və İslamın digər mövzularına son dərəcə ustalıqla yanaşmışdır. Nəticə etibarı ilə, İslam dinini öyrənmək və şəriət

**TƏBƏRİ KİMDİR?**

Məhəmməd İbn Cərir ət-Təbəri hicri 225 miladi 839-cu ildə Təbəristanın Amul şəhərində (Xəzər dənizinin cənubunda) dünyaya gəlmişdir.

Yeddi yaşında Qurani-Kərimi əzbərləmiş, doqquz yaşında da hədis yazmağa başlamışdır. Elm əldə etmək üçün Rəy, Bəsrə, Kufə, Mədinə, Suriyə və Misiri gəzmiş, daha sonra xəlifəliyin mərkəzi olan Bağdada yerləşmişdir.

Təfsir elmi ilə birlikdə qiraət, hədis, fiqh, kəlam və tarix elmlərində ustad olan İbn Cərir fiqhdə də müctəhidlik mərtəbəsinə yüksəlmişdir. Çoxlu sayda tələbə yetəşdirmiş və sahib olduğu elmlərin bir çoxuna dair otuza yaxın əsər yazmışdır.

Təbəri 310/922-də şəvval ayında vəfat etmiş və yaşadığı evin içində dəfn edilmişdir.

**İBNİ KƏSİR KİMDİR?**

İmaduddin Əbul-Fida İsmail b. Ömər b. Kəsir, Dəməşq civarındakı Busranın kəndlərindən birində hicri 701, miladi 1301 ilində dünyaya gəlmişdir.

Çox kiçik yaşlarında atasını itirmişdir. Kiçik yaşında yetim qalan İbni Kəsir on yaşında Qurani-Kərimi əzbərləmiş, ardından da İslami elmlər sahəsində özünü yetişdirmək üçün dövrünün məşhur alimlərindən təfsir, hədis, fiqh, tarix dərsləri almışdır.

Təhsilini tamamladıqdan sonra xətib, müdərris, müfti və məhkəmə heyətinin üzvü olaraq müxtəlif vəzifələrdə çalışmışdır. Əqidə yönündən Əşari, fiqh yönündən də Şafi məzhəbinə mənsub olan İbni Kəsir, ömrünün sonuna yaxın gözlərini itirmiş, 26 Şaban 774-cü (miladi 1372) ildə 71 yaşında dünyasını dəyişərək Allahın rəhmətinə qovuşmuşdur.

(Ətraflı məlumat üçün bax: İsmail Cərrahoğlu, Təfsir Tarixi II,184-85; Muhsin Dəmirçi, Təfsir Tarixi, səh.154)

elmləri barəsində araşdırma aparmaq istəyən hər bir müsəlmana tövsiyə edilən mükəmməl bir əsərdir.

**Zəməxşəri təfsiri: "**əl-Kəşşaf" adıyla məşhur olan bu təfsirin adı "əl-Kəşşaf an həqaiqit-tənzil"dir. Zəməxşəri təfsirinin girişində Qurani-Kərimi təfsir etməyin olduqca çətin bir iş olduğunu, Ərəb dili və ədəbiyyatı və digər elmlərdə biliyə malik olmağın zəruriliyi və zehni qabiliyyətlərin çox güclü olmasının lazım gəldiyini bildirir. (Zəməxşəri, "əl-Kəşşaf", I, səh.15-16)

Zəməxşəri təfsirində ərəb dilinin qrammatik yönlərini, məcaz və bəlağətin incəliklərini son dərəcə gözəl bir metodla və ustalıqla ələ almışdır. Özü Mötəzilə məzhəbinə mənsub olduğuna görə təfsirini bu məzhəbin fikirləri istiqamətində yazmışdır. Ancaq buna baxmayaraq, dil və ədəbiyyat baxımından olduqca möhtəşəm bir təfsir olduğuna görə digər məzhəbə mənsub alimlər tərəfindən çox bəyənilmiş və təqdir edilmişdir. Bu xüsusiyyəti səbəbi ilə öz sahəsində yazılan təfsirlər içərisində ən möhtəşəm əsərdir. Müfəssir təfsirində ayrıca ərəb şeirlərindən istifadə etmiş, qiraət fərqliliklərini qeyd etmiş, nasix və mənsux mövzularından da bəhs etmişdir. Əhkam ayələrinin izahında Hənəfi məzhəbini mənimsəyən müəllif, əqidə yönündən Mötəzilə məzhəbinin fikirlərini dəstəkləmişdir.

**Razi təfsiri:** Fəxrəddin ər-Razi təfsirin xaricində kəlam, fiqh, fəlsəfə, tibb, riyaziyyat kimi bir çox sahədə mütəxəssisləşmiş bir alimdir. Təfsirin dirayət metodunun ən mükəmməl nümunələrindən biri olan təfsirinin adı "Məfatihül-Qeyb"dir. Təfsir dirayət təfsiri olsa da, müfəssir rəvayət metodundan da kənarda qalmamışdır. Ayələri təfsir etməyə başlayarkən ilk öncə nüzul səbəblərinə geniş yer vermiş və daha sonra ayəni ayə ilə və ya ayəni hədis və səhabə sözləri ilə təfsir etmişdir. Təfsiri həddindən artıq geniş və o qədər çox yönlüdür ki, ayələrin təfsirində toxunduğu mövzular olduqca müxtəlifdir. Bu yönü ilə "Məfatihul-Qeyb" təfsirlə birlikdə dövrünün bir çox elmini əhatə edən ensiklopedik bir əsərdir. Misal olaraq; "Fatihə" surəsinin bir cild tutan təfsirində Razi lüğət, qrammatika, bəlağət, ədəbiyyat kimi dil elmlərindən; fiqh, hədis, kəlam, məzhəblər tarixi kimi dini elmlərdən faydalanmışdır. Həmçinin "Fatihə" surəsinin təfsirində müəllif dövrünün fəlsəfi elmləri, məntiq, fizika, astronomiya, riyaziyyat, metafizika, əxlaq və siyasətdən; sehr, astrologiya, təsəvvüf kimi digər elmlər haqqında uzun-uzadı izahatlar vermişdir. Buna görə bir çox İslam alimi "Məfatihul-Qeyb"də təfsirlə yanaşı hər şeyi tapmağın mümkün olduğunu söyləyərək onun esliklopedik tərəfinə diqqət çəkmişlər.

Razi, hökm və əqidə ilə bağlı da geniş izahlara yer vermiş, əqli və nəqli dəlillərdə Əhli-sünnənin görüşlərini müdafiə edərək Mötəziləni tənqid etmişdir.

Bir neçə dəfə çap edilən bu möhtəşəm əsər 32 cilddən ibarətdir. Bu qədər böyük olduğuna görə, bəzi İslam alimləri tərəfindən sadələşdirilmişdir.

**Beyzavi təfsiri:** Beyzavinin təfsirinin adı "vəhyin nurları və açıqlamanın sirləri" mənasına gələn "Ənvarut-tənzil və Əsrarüt-təvil"dir. Beyzavinin təfsirinin mənbələri Zəməxşəri və Fəxrəddin ər-Razinin təfsirləri ilə Rağib əl-İsfahaninin "əl-Müfrədat" adlı əsəridir. Bu əsərlərin bir xülasəsi kimi olduğuna və öz dövrünə görə bir çox elmi içində əhatə etdiyinə görə İslam aləmində çox bəyənilmiş və mədrəsələrdə dərslik kimi istifadə edilmişdir. Orta həcmli (2-3 cild), yüzlərlə haşiyə və şərhləri olan bu əsər dəfələrlə çap edilmişdir.

Beyzavi təfsirində rəvayət və dirayət metodlarının hər ikisindən böyük ustalıqla istifadə etmişdir. Ayələri təfsir edərkən başqa ayələrə, hədislərə, səhabə və tabiunun görüşlərinə müraciət etmişdir. Ayələrin dil və bəlağət yönlərini də diqqətli şəkildə ələ alaraq incələyən müfəssir zaman-zaman Ərəb ədəbiyyatı və şeirlərindən də dəlillər gətirmişdir. Hökm ehtiva edən ayələrin təfsirinə də yer verən müəllif Şafei və Hənəfilərin görüşlərini müqayisə etmiş, özü Şafei olduğu üçün daha çox Şafei məzhəbinin fikirlərinə üstünlük vermişdir. Bəzi ayələrdəki qiraət məsələlərinə də toxunmuş, digər təfsirlərdəki İsrailiyyatdan olan xəbərləri rəvayət etməkdən çəkinmiş, kövni ayələri şərh edərkən də keyfiyyətli bir elmi təfsir metodu ortaya qoymuşdur.

Bütün bu müsbət tərəflərinin yanında Beyzavi təfsirinin digər İslam alimləri tərəfindən tənqidə məruz qalan cəhətləri də olmuşdur. Belə ki, müfəssir surələrin fəzilətlərinə dair zəif və uydurma hədisləri təfsirində qeyd etmişdir.

Nəticə etibarı ilə, bəzi mənfi cəhətləri bir kənara qoysaq, Beyzavini İslam aləmində məşhur edən bu təfsiri olmuşdur. Buna görə də bu təfsirə 250-dən çox şərh və izah yazılmışdır. Bu sayda şərh hər bir təfsirə yazılmamışdır. Bu təfsir İslam mərkəzlərində və Avropa ölkələrində dəfələrlə çap edilmişdir.

**Cəlaleyn təfsiri:** Bu əsər iki alimin yazdığı bir cildlik təfsir kitabıdır. Cəlaləddin əl-Məhəlli Qurani-Kərimi başdan "İsra" surəsinin sonuna qədər kəlmə-kəlmə təfsir etmişdir. Onun vəfat etməsi ilə tələbəsi Cəlaləddin əs-Süyuti eyni metodla "Kəhf" surəsindən Quranın sonuna qədər bu təfsiri tamamlamışdır. Eyni adlı iki alimin təfsir etdiyi bu kitaba "Cəlaleyn təfsiri" adı verilmişdir. Cəlaleyn təfsiri Qurani-Kərimin

**ZƏMƏXŞƏRİ KİMDİR?**

Carullah Mahmud b. Ömər əz-Zəməxşəri, bugünkü Türkmənistanın əhatəsində olan Xarəzm bölgəsindəki Zəməxşər qəsəbəsində hicri 467, miladi 1075-ci ildə dünyaya gəlmişdir.

Buxara, Xorasan, İsfəhan, Bağdad, Şam, Məkkə və Yəmən kimi İslam tarixində önəmli dini mərkəzlər olan bu bölgələri gəzərək elmini dərinləşdirmişdir. Ərəb dilinin incəliklərini öyrənmək üçün çöllərdə yaşayan Ərəb qəbilələrini ziyarət etmiş və buralarda dil elmini inkişaf etdirmişdir. Özü türk olmasına baxmayaraq Ərəb dilini ərəblərdən daha mükəmməl öyrənmiş və bu elmi sayəsində ərəblərə meydan oxumuşdur. Yazdığı təfsir də bunun ən gözəl dəlilidir.

Ərəb əbədiyyatı, lüğət, bəlağət, təfsir, hədis və fiqh sahələrində altmışdan çox əsəri olan Zəməxşəri, 538/1143 ilində Xarəzmin Cürcaniyyə qəsəbəsində dünyasını dəyişmişdir.



### FƏXRƏDDİN ƏR-RAZİ KİMDİR?

Əsil adı Fəxrəddin Məhəmməd b. Ömər b. Hüseyn ər-Razi hicri 543, miladi 1149-cu ildə Böyük Səlcuqlu dövlətinin baş şəhəri olan Rəy şəhərində dünyaya gəlmişdir.

Ailəsi ərəb əsillidir. İlk dini təhsilini atası Ömər b. Hüseyndən aldığı rəvayət edilir. Elmi öyrənmək üçün bir çox alim kimi Türküstan, Əfqanıstan, Hindistan, Buxara, Səmərqənd və Gəznə kimi elm mərkəzlərini gəzmişdir. Bu səyahətlərdən sonra Buxaraya qayıtmış, orada bir müddət qaldıqdan sonra müəyyən səbəblərə görə oranı tərk edərək doğulduğu yer olan Rəyə qayıtmışdır.

Üstün zəkası, güclü hafizəsi, təsirli xitabəti ilə tanınan və XII əsrin ən böyük alim və mütəfəkkirlərindən biri sayılan Fəxrəddin ər-Razi kəlam, fiqh, təfsir, Ərəb dili, fəlsəfə, məntiq, astronomiya, tibb və riyaziyyat kimi dövrünün az qala bütün elmlərini öyrənmiş və bu sahələrdə əsərlər qələmə almışdır.

Çoxlu sayda əsər yazan Razi 300 civarında tələbə yetişdirmişdir. Şafei məzhəbinə mənsub olan Fəxrəddin ər-Razi 1 Şəvval 606-cı ildə (29 mart 1210) Heratda vəfat etmişdir.

kəlmə-kəlmə və cümlə-cümlə təfsirindən ibarətdir. Kəlmələrin mənaları, cümlələri tamamlayan kəlmələr, qısaltmalar göstərilmiş, bəzi kəlmələrin cümlə içində təxmini mənalarına işarələr edilmişdir. Hürufü-müqəttəə deyilən bəzi surələrin başındakı hərflərin təfsiri verilməmiş, sadəcə, "Allah bununla nəyi qəsd etdiyini daha yaxşı bilir" deyilərək kifayət edilmiş, qiraət fərqlilikləri az da olsa izah edilmişdir. Uzun illər boyu dini elmləri öyrənən tələbələrin mütləq surətdə istifadə etdikləri bu təfsir günümüzdə də təfsir öyrənmək istəyənlər üçün çox rahat oxuna bilən və anlaşılan bir kitab olaraq tövsiyə edilir. Cəlaleyn təfsiri üzərində çoxlu sayda şərhlər və haşiyələr tərzində çalışmalar edilmişdir.

### 1. Qurani-Kərimin türk dilinə tərcüməsi və təfsiri

Türk xalqlarının mədəniyyət tarixində din kitablarının bu dilə tərcümə edilməsi müxtəlif türk boylarının beynəlmiləl dinlərlə təmas qurduqları dövrlərdə başlamışdır. Türklər qədim zamanlarda buddizmlə tanış olmuşdu. Türk dilindəki qədim terminlərin bir çoxu islam ədəbiyyatına türk dilinə tərcümə edilən buddizm dininə aid əsərlərdən keçmişdir. Türklər buddizmdən başqa Zərdüştlük, Manixeizm və Xristian dinləri ilə də təmas qurmuşdular. Türklərin böyük mədəni və ticarət mərkəzlərində bütün bu dinlərə mənsub insanlar yaşamışlar. Yüz ildən bəri aparılan tədqiqatlar nəticəsində bu dinlərin müqəddəs kitablarının türk dilində tərcümələri tapılmışdır.

Türklər X əsrin ortalarında İslam dinini kütləvi olaraq qəbul etdikdən sonra, bu yeni dinin təlimatını və əsaslarını öyrənmə ehtiyacı duyduqları və dinin əsas mənbəyi olan Quranı anlamaq üçün öz dillərinə tərcümə etdirmək istədikləri şübhəsizdir.

İslamdan əvvəl türklər arasında Uyğur əlifbası yayılmışdı. İlk türkcə Quran tərcümələrinin də bu əlifba ilə tərcümə edilmə ehtimalı böyükdür. Ancaq bu günə qədər Uyğur əlifbası ilə yazılmış mükəmməl bir Quran tərcüməsi tapılmamışdır. Bizə qədər gələn ən əski türkcə Quran tərcümələri bunlardır:

1. Rusiya Elmlər Akademiyası Şərqşünaslıq İnstitutunda olan tərcümə.

2. Türk və İslam əsərləri Muzeyində olan tərcümə.

3. İstanbulda Millət kitabxanasındakı tərcümə.

4. Mançestr Şəhərində yerləşən Rylands kitabxanasındakı Quran tərcüməsi.

Bu tərcümələrdən sonra Osmanlı dövründə də Qurani-Kərimin ərəb qrafikası ilə türk dilinə tərcümə və təfsirləri edilmişdir. Ancaq son iki əsrdə (XX və XXI) edilən çoxlu sayda tərcümə və təfsirlər hal-hazırda Türkiyə və türk dili danışan digər ölkələrdə daha çox rəğbət qazanmışdır. Bunlardan ən məşhur olan bir tərcümə haqqında məlumat verəcəyik.

**Almalılı** təfsiri**:** Tam adı "Haqq dini Quran dili" olan bu təfsirin yazarı Məhəmməd Həmdi Yazır, Türkiyənin Antalya şəhərinin Almalı bölgəsindən olduğuna görə əsər Türkiyədə "Almalı təfsiri" olaraq tanınmışdır. Qurani-Kərimin türk oxucusu tərəfindən istifadəsinə nail olmaq və xarici qüvvələrin iddialarına cavab vermək məqsədi ilə Türkiyə Böyük Millət Məclisinin istəyi ilə Diyanət İşləri Başqanlığı türkcə bir təfsir yazdırma qərarına gəlmişdir. Bu fikir Məhəmməd Həmdi Yazıra təklif olunmuş və o da 1926-1938-ci illər arasında 12 il çalışaraq bu təfsiri meydana gətirmişdir. 1935-1939-cu illərdə də Diyanət İşləri Başqanlığı bu təfsiri doqquz cild olaraq çap etmişdir. Daha sonralar bu əsər on cild olaraq yenidən dəfələrlə çap edilmişdir.

Müəllif bu təfsiri rəvayət və dirayət metoduna görə qələmə almışdır. Ayələri təfsir edərkən İsrailiyyatdan gələn məlumatları nəql etməyə olduqca ehtiyatlı davranmış, ancaq eyni dəqiqliyi hədisləri rəvayət edərkən göstərməmişdir. Bəzi ayələri təfsir edərkən o ayəyə uyğun hədisi incələmədən olduğu kimi qeyd etmişdir. Təfsir incələndiyində müfəssirin, təfsirin dirayət metodundan olduqca ustalıqla istifadə etdiyi nəzərə çarpır. Hökm ifadə edən ayələri açıq şəkildə izah etmiş və zaman-zaman Hənəfi məzhəbi ölçüsündə öz fikirlərini də bildirmişdir. Kövni ayələrin izahına da əsərində yer vermiş, astronomiya ilə əlaqədar izahlar gətirmiş, müsbət elmlərə dair ortaya çıxan kəşflərdən bəhs etmiş və bu kəşflərdən Quranın ruhuna tərs düşməyənləri qəbul etmişdir. Dil ilə bağlı ayələrin izahına da toxunan alim, məzhəblərlə bağlı düşüncələrini təfsirində qeyd etmişdir.

Nəticə etibarilə, "Haqq dini Quran dili" adlı bu möhtəşəm əsər yazıldığı tarixdən bu günə qədər bütün türk dünyasında olduqca mötəbər sayılan bir təfsirdir. Özündən əvvəl Türkiyədə yazılan təfsirləri geridə qoymuş, özündən sonra da bütün təfsir, tərcümə və İslamın digər mövzularına dair yazılan əsərlərə

**BEYZAVİ KİMDİR?**

Abdullah b. Ömər b. Məhəmməd əl-Beyzavi hicri 585 miladi 1189-cu ildə əvvəlki Azərbaycan indiki İranın Şiraz şəhərinin yaxınlığındakı Beyzada dünyaya gəlmişdir. Ancaq dünyaya gəlməsi ilə bağlı yuxarıdakı tarix və başqa müxtəlif tarixlər verilsə də, tam olaraq hansı tarixdə doğulduğu dəqiq bilinmir.

İlk təhsilini atasından alan Beyzavi, daha sonra Şiraz alimlərindən müxtəlif elmlər əxz etmişdir. Ərəb dili və bəlağəti, təfsir, hədis, fiqh, məntiq, kəlam kimi əsas elmlərdə yüksək zirvəyə çatmış və bu sahələrdə müxtəlif əsərlər yazmışdır. Fiqh elminə dair yazdığı "Minhacül-vüsul ilə ilmil-üsul" adlı əsəri təfsirindən sonra onu ən çox məşhur edən əsəridir.

Onun həyatından bəhs edən alimlər onun, İslami elmlərdə geniş bilgiyə, böyük elmi qabiliyyətə malik yüksək səviyyəli bir mütəxəssis olduğunu qeyd edib vurğulamışlar.

Uzun müddət qazı vəzifəsində çalışdığına görə ona daha çox "Qazı Beyzavi" deyilmişdir.

Mənbələrin bildirdiyinə Ömrünün sonlarına yaxın Təbrizə yerləşmiş, dünyasını dəyişənə qədər burada elm, ibadət və zöhd həyatı ilə məşğul olmuş və hicri 685 / miladi 1286-cı ildə burada vəfat etmişdir.

Əslən Azərbaycanlı olan bu şöhrətli alimin doğumu kimi ölüm tarixi də təəssüflər olsun ki, dəqiq bilinmir.

nümunə olmuş, onların meydana gəlməsində olduqca mühüm bir mənbə rolu oynamışdır. Hətta alimlərin ortaq fikrinə görə, bu təfsir, əgər ərəbcə yazılsaydı bütün İslam dünyasında tanınmış məşhur təfsirlərdən biri olardı.

**2. Qurani-Kərimin Azərbaycan dilinə tərcüməsi və təfsiri**

Qaraqoyunlu və Ağqoyunlu saraylarında dövlət dili Azərbaycan dili idi. Bu dövrdə türkcənin önəmi gündən-günə artırdı. Mənbələrdən əldə etdiyimiz məlumatlara görə, Ağqoyunlu sultanı Uzun Həsən Quranı Azərbaycan dilinə tərcümə etdirərək hüzurunda oxutdurmuşdur. Bu da Qurani-Kərimin Azərbaycan dilinə ilk tərcüməsi hesab olunur.

Qurani-Kərimin Azərbaycan dilinə tərcüməsi orta çağlarda başlamış olsa da, bu tərcümələr əlyazma şəklində qalaraq nəşr edilməmişdir. Azərbaycanlı müfəssir olan Nemətulla Naxçıvani hələ XV əsrdə "Fəvatihul-ilahiyyə vəl-məfatihül-qeybiyyə" adlı təfsir yazmışdır. Lakin onun bu əsəri ərəb dilində yazılmışdır. Bundan başqa İran və Osmanlı dövlətləri kimi müxtəlif ölkələrdə yaşayıb-yaradan alimlərimiz olmuşlar. Ancaq bu alimlərin tərcümə və təfsirləri indiyə qədər araşdırılmadığı üçün onlar haqqında məlumat vermək qeyri-mümkündür.

Qurani-Kərimin Azərbaycan dilinə ilk tərcümə və təfsiri XX əsrin əvvəllərinə təsadüf edir. Ancaq Sovet İttifaqı qurulduqdan sonra bu fəaliyyətlər olduqca zəifləmiş, dini elmlərlə məşğul olan alimlər ya öldürülmüş, ya da sürgünlərə məruz qalmışlar. Sovet İttifaqı dağılana qədər çox cüzi olaraq və olduqca gizli şəkildə aparılan dini tədqiqatlar Sovet hökumətinin dağılmasından sonra canlanmışdır. 1991-ci ildən etibarən getdikcə yüksələn dini fəaliyyətlər içərisində təfsir və tərcüməyə dair çalışmalar da özünə layiq yeri tutmuşdur. Burada başdan ayağa əvvəlcə təfsir, sonra da tərcümə fəaliyyətləri haqqında məlumat veriləcəkdir:

**a. Təfsirlər**

**1. Mir Məhəmməd Kərim Ağa əl-Bakuvi və "Kəşfül-həqayiq ən nükətil-ayəti vəd-dəqaiq"**adlı təfsiri: Quranın günümüzə qədər gəlib çatan ilk azərbaycanca tərcüməsi və təfsiri Bakı qazısı Mir Məhəmməd Kərim Ağa əl-Bakuvinin "Kəşfül-həqayiq ən nükətil ayati

**CƏLALƏDDİN ƏL-MƏHƏLLİ KİMDİR?**

Cəlaləddin əl-Məhəlli hicri 791 / miladi 1389-cu ildə Misirin Qahirə şəhərində dünyaya gəlmiş və orada yaşamışdır.

Təfsir, məntiq, dil elmləri, fiqh, hədis kimi sahələrdə özünü yetişdirmişdir. Qahirədəki mədrəsələrdə uzun illər fiqh dərslərin tədrisi ilə məşğul olmuşdur.

Hicri 864 / miladi 1460-ci ildə Qahirədə vəfat etmişdir.

**CƏLALƏDDİN ƏS-SÜYUTİ KİMDİR?**

Əbdürrəhman b. Əbu Bəkr b. Məhəmməd əs-Süyuti, hicri 849 / miladi 1445-ci ildə Qahirənin cənub tərəfindəki Süyut qəsəbəsində anadan olmuşdur. Uzun illər Bağdadda qazılıq vəzifəsini yerinə yetirən atası Kəmalüddin əfəndidən ilk dini təhsilini almış, səkkiz yaşında Qurani-Kərimi əzbərləmişdir. Təfsir, hədis, fiqh, lüğət, kəlam, məntiq elmlərində dərinləşmiş və çoxlu sayda hədisi əzbər bilməsi ilə məşhurlaşmışdır. On yeddi yaşına çatdığında həm dərs deməyə, həm də kitab yazmağa başlamışdır. Elmini daha da dərinləşdirmək üçün Misirin xaricində müxtəlif bölgələri gəzmiş, sonunda Misirə geri qayıtmışdır. Cəlaləddin əl-Məhəllidən də dərs oxuyan Süyuti, onun ölümündən sonra yarımçıq qalan Cəlaleyn təfsirini tamamlamışdır. 600-dən çox kitab yazaraq İslam dünyasında ən çox əsər yazan alim ünvanını almışdır. Şafei məzhəbinə mənsub olan Cəlaləddin əs-Süyuti hicri 911 / miladi 1505-ci ildə doğulduğu yer olan Qahirədə vəfat etmişdir.

vəd-dəqaiq" adlı əsəridir. Üç cilddən ibarət olan bu əsər "Kaspi" qəzetinin Buxariyyə mətbəəsində çap edilmişdir. Birinci və ikinci cildi 1904-cü ildə, üçüncü cildi isə 1906-cı ildə nəşr olunmuşdur.

"Kəşfül-həqayiq" təfsiri Ərəb əlifbası ilə yazılmışdır. Ayələrin tərcüməsi sadə ifadələrlə verilmiş və ayələrdəki incəliklər gözəl bir şəkildə ortaya qoyulmuşdur. Təfsir üç cilddən ibarətdir. Birinci cild hicri 1321-ci ilin Şəvval ayının 9-u başa çatmış və 745 səhifədir. İkinci cild isə "Yunus" surəsi ilə başlayır. Bu cildin də yazılışı hicri 1322-ci ilin rəbiüləvvəl ayının 10-da sona çatmışdır. İkinci cild 792 səhifədən ibarətdir. Üçüncü cild isə Rum surəsi ilə başlayır. Yazılışı hicri 1323-cü ilin zülqədə ayının 22-də tamamlanmışdır. Üçüncü cild 959 səhifədir.

Müfəssir hər cildin əvvəlinə bir müqəddimə yazmışdır. O, Quranın bir çox türkcə təfsirlərinin olduğu, amma bunların "şiveyi-osmaniyyədə" olduğu üçün Azərbaycan türkcəsində danışanların bu əsərləri başa düşmədiklərini və buna görə də ən böyük xidmətin Azəri türkcəsində bir təfsir yazmaq olduğunu qeyd edir. Təfsiri hazırlayarkən müfəssir Zəməxşəri, Nəsəfi, Qazı Beyzavi, Razi, Təbərsi, əl-Bəğəvi, Ruhul-Bəyan kimi məşhur əsərlərdən istifadə etmişdir. Əlbəttə ki, müfəssir, sadəcə, bu təfsir qaynaqları ilə kifayətlənməmiş, yeri gəldikcə, müxtəlif sahələrdən, hədis və tarixi mənbələrindən də istifadə etmişdir. O, hədis sahəsində Buxaridən Küleyniyə qədər şiə və sünni qaynaqlarından gələn rəvayətlərdən istifadə etmiş və hədislərin qaynağı kimi səhabəni adil qəbul etmişdir.

Təfsir dirayət təfsiridir. Ancaq Bakuvi yeri gəldikcə təfsirin rəvayət metoduna da geniş yer vermişdir. Yerinə görə ayəni başqa ayə, hədis, səhabə və tabiunun sözləri ilə, bəzən də İsrailiyyatdan istifadə edərək təfsir etmişdir. Dirayət yönünə gəlincə, qrammatik təhlillərdən istifadə etmiş əhkam və kəlama dair ayələrə geniş yer vermişdir. Bəzən elmi təfsirə meyil etmiş, bundan başqa o günün sosial məsələlərini işıqlandırmağa çalışmışdır. Bakuvi "səbəbi-nüzul", ayələr və surələr arasındakı münasibətdən, qiraət məsələlərindən və surələrin başlarında yer alan hürufü-müqəttəədən də bəhs etmişdir.

Şiə məzhəbinə mənsub olduğu məlum olan müəllif məzhəb təəssübkeşliyinə qarşı çıxmış və məzhəblərarası bir orta yolun izlənilməsini istəmişdir. Əhli-Beytə qarşı bəslədiyi sevgini bildirmiş, ancaq onları ifrat

## MƏHƏMMƏD HƏMDİ YAZIR KİMDİR?



Məhəmməd Həmdi Yazır Türkiyənin Antalya şəhərinin Almalı bölgəsində 1878-ci ildə dünyaya gəlmişdir.

İlk təhsilini atası Numan əfəndidən alan Həmdi Yazır kiçik yaşlarında hafizliyini bitirdi və dayısı ilə İstanbula gələrək Ayasofya Mədrəsəsinə daxil oldu. Burada ikən Bəyazid camesində dərslərə davam etdi və Kayserili Həmdi əfəndidən icazətnamə aldı.

İstanbuldakı keçən uzun təhsil həyatından sonra 1906-cı ildə imtahan verərək Bəyazidin baş müəllimi oldu. Burada məntiq, fiqh elmi və müxtəlif dərslər keçdi.

1908-ci ildə Antalyadan millət vəkili seçilərək məclisə girdi. 1926-cı ildə də Böyük Millət məclisinin verdiyi qərarla Quran təfsiri yazmağa başladı. 12 ilə tamamladığı bu təfsirin ardından təkrar ona Ərəb dilindəki bir əsərin tərcüməsi tapşırıldı.

Müəllif bu əsəri tərcümə etməyə başlayarkən ürəyindən naxoş oldu. Bu xəstəliyi getdikcə artdı və 1942-ci il may ayının 27-də 64 yaşında haqqın rəhmətinə qovuşdu. Məzarı İstanbulda Səhrayi-cədid qəbiristanlığındadır.

## MİR MƏHƏMMƏD KƏRİM AĞA ƏL-BAKUVİ KİMDİR?

Tam adı Mir Məhəmməd Kərim ibn Mir Cəfər əl-Ələvi əl-Hüseyni əl-Bakuvi olan müəllif 1853-cü ildə Bakıda anadan olmuşdur. Mir Məhəmməd Kərim soyunu Hz. Əlidən gəlməsi səbəbilə özünü Ələvi, Hz. Hüseyn soyundan gəldiyi üçün Hüseyni və Bakıda anadan olduğu üçün də Bakuvi adları ilə tanıtmışdır. Ancaq onun əsas adı Mir Məhəmməd Kərim ağa Cəfərzadədir. İlk təhsilini mədrəsədə almışdır. 1871-ci ildə Bağdada getmiş və on ilə yaxın orada ərəbcə, təfsir, fiqh, İslam tarixi və digər təməl İslam elmlərini öyrənir. Bağdaddan qayıtdıqdan sonra bir müddət Bakıdakı Şah Məscidində imam və axund, Şiə məscidində sədr olan Bakuvi, şəhər idarə heyəti tərkibində və Bakı şəhərinin qazısı vəzifəsində çalışmışdır.

Məhəmməd Kərim məhərrəmlikdə özünü döyməyə, fanatizmə, batil və xurafata, İslamda təfriqə salanlara qətiyyətlə qarşı çıxmış, 1905-ci ildə erməni-müsəlman davasında bəyaz cübbəsini geyinərək və qırmızı bayrağı əlinə alaraq şəhərə çıxmış, yağış kimi yağan güllələrdən qorxmadan çox qan tökülməsinin qarşısını almışdır.

1920-ci ilin 27 aprelində Azərbaycanı işğal edən Qırmızı ordu hər yeri talan etdiyi kimi Mir Məhəmməd Kərim ağanın da evini talan etmişdir. Bundan sonra Bakuvi Mərdəkana gedərək orada həyatını tərcümə və elmi kitablar yazmaqla davam etdirmişdir. 1937-ci ildə islami fəaliyyətlər göstərdiyi üçün və antisovet olduğu iddia edilərək evindən aparılmış, 15 mart 1939-cu ildə 85 yaşında sovet rejimi tərəfindən güllələnmişdir.

Bakuvi bir çox əsər meydana gətirmişdir. Lakin bu əsərlərin bir çoxu sovet rejimi tərəfindən məhv edilmişdir. Günümüzə, sadəcə, “On yeddi Ramazan” kitabı və “Kəşfül-həqayiq” adlı təfsiri gəlib çatmışdır.

şəkildə ucaltmağa qarşı çıxmışdır. Hz. Əliyə olan sevgisini bəyan edərək, onun vəli olduğunu qəbul edən müəllif Quranı, qısacası, müəyyən bir qrupun anlaya bildiyi düşüncəsinə qarşı çıxmışdır. Məzhəblər arasındakı ayrı-seçkilikdən son dərəcə narahat olmuş, Hz. Əbu Bəkir, Hz. Ömər, Hz. Osman və digər səhabələrə hörmət bəsləmişdir. Xilafət və dörd xəlifə mövzusuna da toxunan müfəssir qətiyyən təfriqəyə yer verilməməsi və İslam ümmətinin birlikdə hərəkət etməsi düşüncəsini vurğulamışdır. İslam ümməti arasındakı ilk ixtilaflara, Cəməl və Siffin savaşlarına da toxunan müəllif müsəlmanların bundan dərs almalarının vacib olduğunu vurğulamışdır.

**2. Mövlazadə Şəkəvi və “Kitabul-bəyan fi təfsiril-Quran” adlı təfsiri:** Bu təfsir də əvvəlki təfsir kimi ərəb əlifbası ilə yazılmışdır. 1908-ci ildə Tiflisdəki Qeyrət mətbəəsində nəşr edilmişdir. Şəkəvinin bu təfsiri, sadəcə, Zaqafqaziya müsəlmanlarının deyil, eyni zamanda, Cənubi Azərbaycan dindarları arasında da çox oxunan və bəyənilən bir əsər olmuşdur.

Təfsir iki cilddən ibarətdir. Birinci cild 492 səhifə, ikinci cild isə 538 səhifədir. İkinci cild “Kəhf” surəsi ilə başlayır. O, təfsirinə yazdığı müqəddimədə Quranın bütün öyüdlərin ən şərəflisi və qissələrin ən fəzilətlisi olduğunu bildirdikdən sonra, Quran ərəb dilində olduğu üçün müsəlman türk qardaşlarının onun zahiri mənalarını anlamaqdan aciz olduqlarını, ondakı dini hökmlərdən və Allahın başqa əmrlərindən bixəbər qaldıqlarını, Quranı anlamaq üçün başqa dillərdəki tərcümələrə müraciət etdiklərini və bunun da doğru olmadığını söyləməkdə, din qardaşlarına Quranı asan anlamalarına və onun əmrlərini yerinə yetirmələrinə yardım etmək üçün bu əsəri qələmə aldığını qeyd etmişdir.

Şəkəvi təfsirini yığcam yazmağa çalışmışdır. Buna görə də təfərrüatlı təhlillərə girişməmişdir. Ancaq yenə də rəvayət və dirayət metodlarına müraciət etmişdir. Yeri gəldikcə Quranın quranla təfsiri, Quranın sünnə ilə təfsiri, Quranın səhabə və tabiun sözləri ilə təfsiri metodlarından və İsrailiyyatdan istifadə etmişdir.

Dirayət yönündən isə əhkam və kəlam mövzularından bəhs etmiş, ancaq bu mövzularda geniş təhlillərə yer verməmişdir. “Əsbabün-nüzul”, “nəsx”, “hürufü-müqəttəə” kimi Quran elmlərindən də zaman-zaman söz açmışdır. Bu əsərə qısa təfsir və ya geniş məal demək daha doğrudur. “Kitabul-bəyan” 1990-cı ildə Bakıda yenidən nəşr edilmişdir.

**3.Əhməd Həşimzadə və "Təfsirul-Quranil-Əzim"** adlı təfsiri: Bu təfsir də özündən əvvəlki təfsirlər kimi ərəb qrafikası ilə yazılmışdır. Ancaq 50 il əvvəl yazıldığı üçün dili əvvəlki təfsirlərə görə müasir, indiki dilə görə klassik tərzdədir. Müfəssiri müəllim olduğu üçün təfsiri olduqca səlis və axıcıdır. Bununla birlikdə xeyli ərəb və fars kəlmələrindən də istifadə etmişdir.

Təfsir Məhəmməd Fizuli adına Əlyazmalar İnstitunda C-697/9650, C-698/9651, C-699/9652 nömrələrdə qeydiyyatdadır. Əsər 1658 səhifədən ibarət olub, qalın dama dəftərlərə yazılmış, 3-4 dəftər birləşdirilərək bir cild halına gətirilmişdir. Vərəqlər müasir standartlara görə hər iki üzü nömrələnmişdir. Təfsir toplam olaraq dörd cilddən.

Birinci cild "Fatihə" surəsindən "Maidə" surəsinə qədərdir. 311 səhifədir.

İkinci cild "Ənam" surəsi ilə "İsra" surəsi arasını əhatə edir. 440 səhifədir.

Üçüncü cild "Kəhf" surəsi ilə başlayır "Fatir" surəsi ilə bitir. Səhifə sayı 441-dir.

Dördüncü cild "Yasin" surəsindən başlayıb Quranın sonuna qədər davam edir. Toplam 466 səhifədir.

Müfəssir təfsirini yazmağa başlamazdan əvvəl birinci cildin ilk səhifəsində bu ifadələrə yer vermişdir:

*"Müəllif Əhməd İsrafil oğlu Həşimzadə. Həzə təfsirul-Quranil-Azim fi lisəni Azərbaycan. Fələm təkunə aləl-əğləb vazıheyni səhleyni. Bu Təfsirul-Quranil-Azimuş-Şan, mən Azərbaycan Respublikası Quba rayon daxilində olan Çiçi kənd sakini Həşimzadə Əhməd İsrafil oğlu tərəfindən yazılmış və cəsarətlə Quranın 6666 ayətinə biqadri-quvvə çox aydın bir şəkildə Ərəbcədən türkcəyə tərcümə etməyimi özümə şərəf hesab edirəm. Və onun içərisində aşkara çıxarılan səhv və nöqsanları öz bağışlanmaq qələmləri ilə mənə razılıq vermələrini bütün oxuculardan xahiş edirəm.*

*Bu təfsiri-şərifin yazılmasını müstəinən billəh itmama yetirmək üçün Allahdan köməklik tələb edirəm.*

*1380-cı tarix hicri / 1960-cı il tarix miladi; Çiçi kəndi."*

4-cü cildin sonunda da təfsiri şəxsən özünün yazdığını və hicri 1382 / miladi 1962-cı ildə bitirdiyini qeyd etmişdir. Həşimzadə təfsirini yazarkən bir çox

**MƏHƏMMƏD HƏSƏN MÖVLAZADƏ ŞƏKƏVİ KİMDİR?**



Məhəmməd Həsən Mövlazadə Şəkəvi, 1854-cü ildə Şəkidə anadan olmuşdur.

Şəkəvinin həyatı haqqında əlimizdə təəssüf ki, hələlik dəqiq məlumatlar yoxdur. Onun haqqındakı bu əskik məlumatları bəzi kitablardakı qeydlərdən və internetdəki materiallardan əldə edə bilirik.

İlk dini təhsilini Şəkidə almışdır. Daha sonra təhsilini Gəncə mədrəsəsində davam etdirmiş, bu mədrəsəni də bitirdikdən sonra bir il Gəncə Cümə Məscidində din xadimi kimi fəaliyyət göstərmişdir.

Şəkəvi bu fəaliyyətinin ardından dini təhsilini daha artırmaq üçün İraqa getmiş və orada dövrün alimlərindən müxtəlif dərslər alaraq özünü yetişdirmişdir.

1891-ci ildə Qafqaza qayıdan Şəkəvi 1893-cü ildə Tiflisdə yerləşən "Müsəlman dini məktəbi"ndə Şəriət dərsləri deməyə başlamışdır. Sonralar Cəbrayıl, Gəncə, Tiflis və Kutaisi bölgələrinin Qazısı kimi fəaliyyət göstərir.

1908-ci ildə Məhəmməd Həsən Mövlazadə Qafqaz bölgəsi üzrə Şeyxülislam seçilir.

Mövlazadə Məhəmməd Həsən İsmayıl oğlu Şəkəvi 1932-ci ildə vəfat etmişdir.

qaynaqdan istifadə etmişdir. Hər cildin əvvəlində istifadə etdiyi mənbələrin adını yazmışdır. Bu təfsirlər aşağıdakılardır:

"Təfsirul-Qazi", "Cəvahirüt-təfsir", "Təfsirül-bəhr", "Bəhrül-ülum", "Təfsirut-tibyan," "Təfsirül-bəsair", "Təfsirül-kəbir", "Təfsirül-kəşşaf", "Təfsirun-Nəsəfi", "Təfsirül-Cəlaleyn", "Təfsirül-məvakib".

Ancaq burada adlarını yazmadığı bəzi təfsirlərdən də istifadə etmişdir. Təfsir qısa təfsir və ya geniş məal şəklindədir. Rəvayət və dirayət metodlarının hər ikisindən də istifadə etmişdir.

**ƏHMƏD HƏŞİMZADƏ KİMDİR?**

Əhməd Həşimzadə 1896-cı ildə Azərbaycanın Quba rayonunun Çiçi kəndində dindar bir ailədə dünyaya gəlmişdir. Soyadı özünün rəsmi sənədlərində "Həşimov"dur. Ancaq təfsirində və digər bəzi yazılarında soyadını "Həşimzadə", bəzən də "İsrafilzadə" yazmışdır.

İlk dini təhsilini yeddi yaşında atası İsrafil əfəndidən almışdır. Atası vəfat etdikdən sonra təhsilini Qubanın Afurca kəndidənki Hüseyn Ağa əfəndidə davam etdirmişdir. 1909-cu ildə orta məktəbə başlamış, ancaq məktəbi bitirə bilməmişdir. Bu ərəfədə bölgənin elm adamlarından xüsusi olaraq ərəbcə, farsca dərsləri almışdır. 1911-1919-cu illərdə Dəvəçinin Pirəmsən kəndindəki kiçik bir məsciddə Qalagah kəndindən olan dövrün elm adamlarından Əbdülvəhhab əfəndidən və Təngəaltı kəndindən olan İshaq əfəndidən dini dərslər almışdır. Bu müddət ərzində Ərəb və Fars dillərini mükəmməl öyrənməklə yanaşı, fiqh, hədis, tarix, fəlsəfə, astronomiya kimi elmlərdə də özünü yetişdirmiş və Şamaxılı Musafa əfəndidən o dövrün mühüm sənədi sayılan "İcazətnamə" almışdır. Dərs aldığı müəllimləri vəfat etdikdən sonra onların kitablarını əldə edən Həşimzadə, bu kitablarla mütaliə edərək bilgilərini daha da dərinləşdirmişdir.

1920-1923-cü illər arasında Üsuli-cədid məktəbini oxumuşdur. 1924-cü ildə Quba şəhərində açılan müəllimlik kursuna daxil olmuş və bu əsnada da müəllim təyin olunmuşdur. Daha sonra Şuşa Pedaqoji texnikumuna daxil olmuş və 1930-cu ildə bu məktəbi bitirmişdir. 1935-ci ildə Vladimir İliç Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstituna qiyabi olaraq daxil olmuş və 1941-ci ildə buradan məzun olaraq diplom almışdır. Bu İnstitut Həşimzadənin rəsmi olaraq bitirdiyi son məktəb olmuşdur. Müfəssirin təhsil həyatı ilə tədris həyatı paralel şəkildə davam etmişdir. İllər boyu Quba rayonunun ətraf kəndlərində, Dəvəçi və Xaçmazdakı məktəblərdə müəllimlik və məktəb direktoru, hətta 1935-1936-cı illər də Qonaqkənd Rayon Xalq Maarif şöbəsində İnspektor vəzifəsində çalışmışdır. 1947-ci ildə öz kəndi olan Çiçiyə geri qayıtmış və Çiçi kənd məktəb direktoru vəzifəsinə təyin edilmişdir. 1959-da 36 illik müəllimlik həyatına son verərək təqaüdə çıxmışdır.

Əhməd Həşimzadənin müəllimlik fəaliyyəti, dövlət tərəfindən qiymətləndirilmiş və ona 1949-cu ildə "Qırmızı Əmək Bayraqlı Şöhrət Ordeni" təqdim edilmiş və "Əməkdar müəllim" fəxri ünvanı verilmişdir.

Həşimzadə təqaüdə çıxdıqdan sonrakı bütün vaxtını təfsir yazmağa həsr etmiş və 1962-ci ildə bu çalışmasını tamamlamışdır. Təfsirini Azərbaycan Milli Elmlər Akademiyası, Əlyazmalar İnstituna şəxsən özü təhvil vermişdir. İnstitutun altı nəfərlik komissiyası təfsiri incələmiş və müsbət rəy verərək onu kitabxanaya qəbul etmişlər. Əsərin müqabilində müfəssirə 600 rubl (800-900 USD) təklif etmişlər. Ancaq Həşimzadə bu məbləği almaqdan imtina etmiş və bu əsəri pul üçün yazmadığını, xalq üçün yazdığını və məqsədinin gələcək nəsillərin, Qurani-Kərimin mənasına anlamağa yardımçı olmaq olduğunu bildirmişdir. Ancaq bu məbləğ ona hədiyyə olaraq təqdim edilmişdir.

Əhməd Həşimzadə 16 aprel 1979-cu ildə dünyasını dəyişmişdir. Məzarı doğulduğu kənd olan Çiçi kəndinin qəbiristanlığındadır.

Həşimzadənin təfsirindən başqa kiçik məktəb dəftərlərinə yazdığı şeir kitabı, vəsiyyətnaməsi və oxuduğu əsərdən aldığı qeydləri vardır.



Quranın Quran, hədis, səhabə və tabiunun sözləri ilə təfsiri metodundan istifadə etmişdir. Nəql etdiyi hədislərin heç birini tənqid etməmiş və mənbə də göstərməmişdir. Filoloji baxımından ələ aldığımız zaman qrammatika və bəlağətdən istifadə etməmiş, sadəcə, zaman-zaman kəlmələri açıqlamaqla kifayətlənmişdir. Əhkam ayələrini açıqlayarkən Əhli-sünnənin görüşlərinə tabe olmuş, əsasən, dörd məzhəbdən kənara çıxmamışdır. Ancaq bu mövzulara səthi toxunmuş, çox dərinliklərə girməmişdir. Yeri gəldikcə müfəssir, kəlam, təsəvvüflə əlaqədar mövzulardan bəhs etmiş, hürufu-müqəttəə deyilən surələrin başında yer alan hərflərlə əlaqədar alimlərin görüşlərinə qısa şəkildə yer vermişdir. Surələrin nazil olma səbəblərini də yerinə görə açıqlamış, Quranda nəsxi qəbul etmişdir. Surələrin fəziləti mövzusuna da toxunmuş və bu barədəki bəzi hədisləri qeyd etmişdir.

Nəticə etibarı ilə, Əhməd Həşimzadənin bu təfsiri özündən əvvəl yazılan digər iki təfsir kimi elmi yöndən zəngin olmasa da, Sovet hakimiyyətinin ən kəskin vaxtlarında yazılaraq Əlyazmalar İnstituna sağlam bir şəkildə təhvil verilməsi və eyni şəkildə əlimizə çatması onun dəyərini ikiqat artırır. Çünki repressiyaların tüğyan etdiyi bir dövrdə Həşimzadə böyük cəsarət göstərərək bu nəcib işə özünü həsir etmiş və Qurani-Kərimin tamamını təfsir etməyə nail olmuşdur.

### b. Tərcümələr

#### 1) Vasim Məmmədəliyev və Ziya Bünyadov, “Quran”

Azərbaycan müstəqilliyini əldə etdikdən sonra 1992-ci ildə ölkəmizin iki dəyərli elm adamı Vasim Məmmədəliyev və Ziya Bünyadovun hazırladığı bu məal kiril əlifbası ilə Qurani-Kərimin müasir Azərbaycan dilinə tərcüməsidir. Kitabın əvvəlində Qurani-Kərim və təfsirə dair olduqca dolğun məlumatların yer aldığı bir ön söz vardır. Sonunda da mütərcimlərin önəmli gördükləri hər surəyə dair qısa şərhlər verilmişdir.

Mütərcimlər Quranı şeir tərzində tərcümə etmənin imkansız olduğunu, hərfi tərcüməyə həddindən artıq yer vermənin isə Quranı anlaşılmaz hala gətirəcəyini və mütərcimin əməyini boşa çıxaracağını söyləyərək açıqlamalı ədəbi tərcümənin ərəb dilini bilməyən oxuculara Quranın mənasını imkan daxilində dəqiq anlamaları üçün ən əlverişli metod olaraq qəbul etmişlər.

Tərcümənin sadə, aydın və müasir bir dili vardır. Tərcümədə qrammatik qaydalara tam olaraq əməl olunmuşdur.

İlk çap olunan məalda ərəbcə mətn verilməmişdir. Daha sonra çap olunan məallarda isə ərəbcə mətn də vardır. Tərcüməçilər əvvəlcə surənin ərəbcə adını, daha sonra isə mötərizə içərisində Azərbaycan dilində tərcüməsini vermiş, Məkkədə və ya Mədinədə nazil olduğunu və neçə ayədən ibarət olduğunu qeyd etmişlər. Ayələrin daha yaxşı başa düşülməsi üçün mötərizə içərisində izahlara yer verilmişdir. Bəzi eyni ifadələr Azərbaycan dilində müxtəlif sinonimlərlə əvəzlənmişdir. Orijinal mətndə olmayan, ancaq qəsd olunan xitablar mötərizə arasında "Ya Mühəmməd"," Ya Peyğəmbər", "Ya Rəsulum," "Ey müsəlmanlar" şəklində təqdim olunmuşdur. Məalda bəzi söz və ifadələrin tarixi və coğrafi adları, şəxs adlarının qısa açıqlaması mətnin daxilindəki mötərizə aralarında, daha geniş açıqlamaları isə məalın sonundakı şərhlərdə qeyd olunmuşdur.

Tərcümədə Təbəri, İbn Kəsir, Beyzavi, Razi, Zəməxşəri, Sabuni,Təbrərsi kimi müfəssirlərin təfsirlərindən, türkcə məallardan və Mir Məhəmməd Kərim Bakuvi və Mövlazadə Şəkəvinin təfsirlərindən istifadə edilmişdir.

İllərdir Azərbaycan oxucusunun əlindən düşməyən bu dəyərli tərcümə doqquz dəfə nəşr edilmişdir. Son nəşri 2007-ci ildə "İpəkyolu" nəşriyyatının təşəbbüsü ilə yenidən ərəbcə və latın qrafikası ilə tərcüməsi də birlikdə olaraq nəşr edilmişdir.

**2) Nəriman Qasımoğlu, "Qurani-Kərim"**

Məal 1993-cü ildə kiril əlifbası ilə nəşr edilmişdir. Dili müasirdir. Ancaq orta əsrlər dilinə, xüsusilə Dədə Qorqud dastanına meyil güclüdür. Məalda bəzi nöqsanlar və çap xətaları vardır. Tərcümədə ərəbcə mətn verilməmişdir. Əvvəlcə surənin adı verilmiş, surələrin mənaları, Məkki və ya Mədəni olması haqqındakı məlumatlar isə məalın sonundakı "Bəzi izahlar" fəslində qeyd olunmuşdur. Məaldakı mötərizədə verilmiş söz, ifadə və cümlələr, şəxs və işarə əvəzliklərinin kimə və ya nəyə aid olduğunu göstərmək üçün verilmişdir. Bəzi fərqliliklərlə izah edilən kəlmə və ifadələrin ilk mənası qeyd edilmiş, daha sonra isə mötərizə içərisində "və yaxud" ifadəsi ilə digər variantlara yer verilmişdir.

Məalın sonunda olan "Quran açıqlaması: qayıdış Qayğılarımız" başlıqlı məqalədə mütərcim tərcümə, məal, Azərbaycan dastanlarında, atalar sözlərində, folklorunda və ədəbiyyatında Quranın yeri, Azərbaycan xalqının tarixi-mədəni irsini anlamada Quranın rolu kimi mövzulardan söhbət açmışdır.



**3) Məhəmmədhəsən Qənioğlu və Tariyel Bilaloğlu, "Qurani-Kərim** (Azərbaycan dilinə tərcüməsi ilə)"

Bu tərcümə 2000-ci ildə Türkiyə Diyanət Vəqfi tərəfindən latın qrafikası ilə nəşr edilmişdir. Mütərcimlər daha çox hərfi tərcüməyə üstünlük vermişlər. Dili sadə, anlaşılan və aydındır. Tərcümə ilə birlikdə ərəbcə mətn verilmişdir. Bundan başqa məalda ön söz, "surə adları" və "tərcümə mətnində getmiş bəzi ərəb sözləri" başlıqları da vardır.

Surə adları ərəb dilində olduğu kimi qeyd edilmiş, daha sonra isə surənin neçə ayə olduğu, məkki və ya mədəni olduğu göstərilmişdir. Bəzi ifadələr olduğu kimi verilmişdir. Məsələn: müttəqi, münafiq və s. Bu ifadələrin açıqlamaları "Tərcümə mətnində getmiş bəzi

ərəb sözləri" fəslində təqdim olunmuşdur. Ayələrin tərcüməsində böyük hərflə yazılan "Mən, Biz, O və Öz" əvəzlikləri ilə Allah-Təala qəsd olunmuşdur.

**4) Beynəlxalq "Əlhuda " nəşriyyatının tərcüməçilər qrupu, "Qurani-Kərim"**

Məal 2000-ci ildə İranın Beynəlxalq "Əlhüda" nəşriyyatı tərəfindən kiril əlifbası ilə Bakıda çap edilmişdir. Tərcümə bir komissiya tərəfindən həyata keçirilmişdir. Ancaq məalda bu heyətin kimlərdən ibarət olduğu haqqında heç bir məlumat yoxdur. Dili müasir Azərbaycan dili olsa da, axıcı deyildir. Bəzən mətndəki kəlmələr, ifadələr və ayələr düzgün tərcümə olunmamışdır. Tərcümədə ərəbcə mətn yoxdur. Surə adları ərəbcə olduğu kimi qeyd edilmiş, surələrin Məkkədəmi, yoxsa Mədinədəmi nazil olması haqqındakı məlumatlar, tərcümənin sonundakı mündəricat qismində qeyd edilmişdir. Bəzi xüsusi adlar Azərbaycan dilindəki qarşılıqları ilə işlədilmişdir. Məsələn:Yusuf-Yusif kimi.

Ayələrin nömrələri həmin ayələrin sonunda qeyd edilmişdir. Mötərizədən şəxs və işarə əvəzliklərini və qısa izahları göstərmək, bundan başqa yarımçıq cümlələrin tamamlanması üçün istifadə olunmuşdur.

**5) Rəsul İsmayılzadə Duzal, "Qurani-Kərim və Azərbaycan türkcəsi ilə tərcüməsi".**

1990-cı illərdə çap olunmasına baxmayaraq, ərəb əlifbası ilə çap edilmişdir. Ərəb qrafikası ilə çıxmasının ən əsas səbəbi də Cənubi Azərbaycanda yaşayan türklər üçün nəzərdə tutulmasıdır. Məal 1999-cu ildə Quranın Xarici Dillərə Tərcümə Mərkəzi tərəfindən Qum şəhərində nəşr edilmişdir. Tərcümənin latın və kiril əlifbaları ilə çap olunan nüsxələri mövcuddur. Ayələri tərcümə edərkən mütərcim əlindən gəldiyi qədər hər bir kəlmənin haqqını verməyə çalışmışdır. Ancaq bədii gözəllik ön planda tutulmuşdur. Məalda orijinal mətn də vardır. Surələrin baş hissəsində surə adı, ayələrin sayı və Məkki və Mədəni olması haqqında məlumat verilmişdir. Məal hizb və cüzlərə bölünmüşdür. Tərcümənin sonunda vəqf işarələri haqqında məlumatlar və surələrin mündəricatı vardır. Mötərizələrdən sözlərin izah və mənalarını, əlavə məlumatları oxucuya çatdırmaq üçün istifadə olunmuşdur.

**6) Əhməd Kayvanpur, "Quran".**

Azərbaycan dilində yazılan Quran tərcümələrindən biri də Əhməd Kayvanpurun Quran tərcüməsidir. Bu tərcümə şəmsi təqvimi ilə 1369-1371-ci illər ərzində İranın Tehran şəhərində ərəb əlifbası ilə iki dəfə "İqbal nəşriyyat" tərəfindən çap edilmişdir. Tərcümə əlimizdə olmadığı üçün haqqında ətraflı malumata malik deyilik.

Bütün bu tərcümələrdən əlavə istər Azərbaycanda, istərsə də İranda Quranın Azərbaycan dilində bəzi tərcümələrinin və ya yarımçıq tərcümələrinin olduğu söylənilir.

**7) Əlixan Musayev, "Qurani-Kərim və Azərbaycan dilinə mənaca tərcüməsi".**

Bu tərcümə də 2000-ci ildən sonrakı illərdə hazırlanmış bir məaldır. Kitab dörd dəfə çap edilmiş, sonuncu dəfə 2010-cu ildə Şərq-Qərb mətbəsində çap edilmişdir. Bizim incələdiyimiz kitab son nəşr olunan məaldır.

Kitabın girişində bir ön söz, sonunda da "Ərəb ifadələri və terminlərinin izahlı lüğəti" adı altında bəzi kəlmələrin və ifadələrin açıqlaması verilmişdir. Ən sonda da surələrin adları, endiyi yerlər və sıra nömrələri göstərilmişdir. Surə başlarında surələrin ərəbcə adları və mənaları verilmişdir.

Kitabda Ərəbcə və latınca mətn birgə verilmişdir. Mütərcim daha çox təfsiri tərcümə metodundan istifadə etmişdir. Mötərizə daxili açıqlamalara olduqca az yer vermişdir. Tərcüməsi axıcıdır. Bu tərcümənin ən üstün özəlliyi, Quranın ana mətni bitdikdən sonra müəllifin “Ayələrin müxtəsər təfsiri” başlığı altında bütün surələrin və bəzi mühüm ayələrin qısa təfsirini verməsidir.

**8) Ələddin Sultanov, “Qurani-Kərim və Sözbəsöz tərcüməsi”.**

Azərbaycanda ilk dəfə Qurani-Kərimin sözbəsöz tərcüməsi Ələddin Sultanov tərəfindən hazırlanmışdır. Qurani-Kərimin Ərəbcə və Azərbaycanca mətninin ikisinin bir arada verilmiş nümunələrini görmüşdük. Bu tərcümənin digər tərcümələrdən fərqli cəhəti odur ki, Ərəbcə və Azərbaycanca olan bütün kəlmələr müxtəlif rənglərlə verilmiş və ərəbcə kəlmələrin altında öz rəngində Azərbaycanca mənası verilmişdir. Yəni, ərəbcə hər bir kəlmənin hansı mənaya gəldiyi altda Azərbaycanca kəlmə ilə bildirilmişdir. Beləcə, ərəbcə bilməyən oxucular bu rənglərə diqqət edərək ərəbcə kəlmələrin hansı mənaya gəldiyini altındakı Azərbaycanca həmin rəngdə yazılmış kəlməyə baxaraq asanlıqla tapa bilərlər. Bu kitabda ayələr kəlmə-kəlmə tərcümə edilsə də, cümlələrin quruluşu pozulmamışdır.




İslam ölkələrinin bir çoxunda bu metodla hazırlanmış Qurani-Kərim tərcümələri mövcuddur. Ancaq Azərbaycanda belə bir tərcümə daha əvvəl yox idi. Müəllifin üç ildən artıq bir zamanda üzərində çalışdığı bu möhtəşəm əsər, nəhayət, 2012-ci ildə işıq üzü gördü. Bu tərcümə Azərbaycandakı əksər oxucuların böyük rəğbətini qazanmışdır.

Kitabda surələrin adları ərəbcə, yanında da Azərbaycanca verilmiş və neçənci surə olduğu qarşısında ərəbcə və Azərbaycanca göstərilmişdir. Surələrin mənaları verilərkən sözbəsöz tərcümə burada da öz əksini tapmışdır. Eyni zamanda, surənin harada nazil olduğu da göstərilmişdir. Müəllif kitabdan istifadə etmə qaydalarını “Kitabdan istifadə etmə qaydaları” başlığı altında kitabın sonunda qeyd etmişdir. Surələrin adları, sıra və səhifə nömrələri də “Mündəricat” adı altında göstərilmişdir.

Tərcümə “İpəkyolu” nəşriyyatının təşəbbüsü ilə “Şərq-Qərb” nəşriyyat evinin mətbəəsində 04.08.2012-ci ildə çap olunmuşdur. Birinci tirajın bitməsi ilə ikinci dəfə kitab təkrar 2013-cü ildə təkrar çap edilmişdir.

Öz sahəsində bir ilk olan bu tərcümənin nəhayət, Azərbaycanda hazırlanıb oxuculara təqdim edilməsi olduqca sevindirici və qürurverici bir haldır.

## BEŞİNCİ FƏSLƏ AİD SUALLAR

**Aşağıdakı suallara izahlı cavablar verin.**

1. *Qurani-Kərim endirildikdən sonra onun təfsir edilməsinə olan ehtiyac barədə danışın.*
2. *Peyğəmbərimizin Quranı təfsir etməsinə dair bir neçə misal göstərin.*
3. *Səhabənin təfsirinin əsas xüsusiyyətləri barədə müzakirə aparın.*
4. *Tabiunların təfsir fəaliyyətlərini açıqlayın.*
5. *Təfsirə dair ilk yazılan əsərləri araşdırın. Bu əsərlərin xüsusiyyətləri barədə danışın!*
6. *Məzhəbi təfsirlərin növləri hansılardır?*
7. *Azərbaycandakı təfsir fəaliyyətləri barədə danışın.*

**Aşağıdakı sualların düzgün cavablarını işarələyin.**

***1. Aşağıdakılardan hansı səhabə təfsirinin xüsusiyyətlərindən biri deyildir?***

A) Səhabələr ehtiyac olmadığına görə Qurani-Kərimi başdan axıra qədər ayə ayə təfsir etməmişlər.

B) Əhkam ayələrindən hökm çıxarmamışlar.

C) Səhabələrin etdikləri təfsirlər öz yaşadıqları dövrdə tədvin edilməmişdir.

D) Səhabələr Quranı təfsir edərkən qiyas metodundan istifadə etmişlər.

E) Səhabələr ayəni ayə ilə, nüzul səbəbləri və Hz. Peyğəmbərdən eşitdikləri şərhlərlə təfsir etmişlər.

***2. Aşağıdakılardan hansı rəvayət təfsirinin xüsusiyyətlərindəndir?***

A) Qurani-Kərimi elmi əsaslara görə təfsir etmək

B) Qurani-Kərimi ərəb dili və ərəb şeirlərinə görə təfsir etmək

C) Qurani-Kərimi Hz. Peyğəmbərin hədisləri və səhabə sözləri ilə təfsir etmək

D) Qurani-Kərimi səhabə və tabiunların şəxsi fikirlərini əsas alaraq təfsir etmək

E) Qurani-Kərimi cəmiyyətin sosial problemlərini əsas alaraq təfsir etmək

***3. Aşağıdakılardan hansı dirayət təfsiri deyildir?***

A) Beyzavi təfsiri

B) Razi təfsiri

C) İbn Kəsir təfsiri

D) Bakuvi təfsiri

E) Zəməxşəri təfsiri

***4. Aşağıdakılardan hansı "İctimai təfsir" növünə aiddir?***

A) Əbu Bəkr İbn Ərəbi, "Əhkamül-Quran".

B) əl-Marağı, "Təfsirul-Marağı".

C) Carullah Mahmud b. Ömər əz-Zəməxşəri, "əl-Kəşşaf ən həqaiqit-tənzil".

D) Əbdürrəzzaq b. Həmmam (ö. 211/827), "Təfsirul-Quran".

E) Tantavi Cövhəri, "əl-Cəvahir fi təfsiril-Quran".

***5. Aşağıdakı təfsirlərdən hansı Azərbaycanca təfsir deyildir?***

A) "Kitabül-bəyan fi təfsiril-Quran"

B) "Mədarikűt-tənzil və həqaiqut-təvil"

C) "Təfsirul-Quranil-Əzim"

D) "Kəşfül-həqayiq ən nükətil-ayəti vəd-dəqaiq".

**Cümlələrdəki boşluqları doldurun**

Qurani-Kərimin Quran, sünnə və səhabə sözləri ilə təfsir edilməsinə ........ ........ deyilir.

Qurani-Kərimin insanların müasir düşüncələrinə və sosial problemlərinə görə təfsir edilməsinə ........ ........ deyilir.

Qurani-Kərimin təfsiri ilə əlaqədar rəvayətlərin nizamlı və sistemli bir şəkildə kitablarda toplanmasına ........ ........ deyilir.

Dirayət təfsirinə ....... ........ və ya ........ ........ deyilir.

Zəməxşərinin "əl-Kəşşaf" adlı təfsiri, təfsirin ........ metoduna aid təfsirdir.

**Aşağıdakı müfəssirlərin önünə təfsirlərini düzgün şəkildə rəqəmlə qeyd edin.**

| № | Müfəssir | Təfsir kitabı | № |
|---|---|---|---|
| 1. | Rəşid Rıza | Təfsirül-Quranil-Əzim | |
| 2. | Əbu Bəkr İbni Arabi | Haqq dini Quran dili | |
| 3. | əz-Zəməxşəri | Kəşfül-həqayiq ən nükətil-ayəti vəd-dəqaiq | |
| 4. | Fəxrəddin ər-Razi | Ənvarut-tənzil və əsrarut-təvil | |
| 5. | Ömər b. Muhamməd əl-Beyzavi | Əhkamül-Quran | |
| 6. | Tantavi Cevhəri | Təfsirul-Quranil-həkim | |
| 7. | Muamməd Həmdi Yazır | Kitabul-bəyan fi təfsiril-Quran | |
| 8. | Mir Məhəmməd Kərim Ağa əl-Bakuvi | əl-Cəvahir fi təfsiril-Quran. | |
| 9. | Mövlazadə Şəkəvi | Məfatihul-qeyb | |
| 10 | Əhməd Həşimzadə | əl-Kəşşaf ən həqaiqit-tənzil | |